QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Aprel 2018
№ 4 (1091)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Azərbaycan Respublikasında “Elm günü”nün təsis edilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və cəmiyyətin inkişafında elmin əhəmiyyətini nəzərə alaraq **qərara alıram:**

Hər il martın 27-si Azərbaycan Respublikasında “Elm günü” kimi qeyd edilsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 9 aprel 2018-ci il.*

## Fizika və texnologiya fakültəsində ənənəvi “Fizika günü”

Aprelin 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində ənənəvi “Fizika günü” keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, İnzibati və iqtisadi işlər üzrə prorektoru Ümid Mehdiyev, fakültə dekanları, kafedra müdirləri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Fizika İnstitunun əməkdaşları, tələbələr iştirak ediblər.



Tədbirin əvvəlində ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək Prezident seçkisinin yüksək səviyyədə keçdiyini bildirib və cənab İlham Əliyevi xalqımızın



böyük dəstəyi ilə yenidən Azərbaycan Respublikasının Prezidenti seçilməsi münasibətilə təbrik edib və dövlət başçımıza uğurlar arzulayıb.




Çox maraqlı və rəngarəng keçən tədbirdə fakültə tələbələrinin ifasında rəqslər, səhnəciklər, mahnılar ifa olunub, fizikaya aid təcrübələr nümayiş etdirilib və alqışlarla qarşılanıb.

Sonda Fizika və texnologiya fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov tədbirin təşkilində və keçirilməsində fəal iştirak etdiklərinə görə fakültə Tələbə Elmi Cəmiyyətinin (TEC) və Tələbə Şurasının sədrlərinə, AMEA-nın Fizika İnstitutunun əməkdaşlarına təşəkkürünü bildirib.

## Tədris-Metodiki Şuranın iclası

Aprelin 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tədris-Metodiki Şurasının iclası keçirilib. Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov Tədris-Metodiki Şuranın iclasını giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə ADPU-nun rektoru, professor Cəfər Cəfərovun “Təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi haqqında” 30.05.2017-ci il tarixli 3/85 nömrəli əmrinin icra vəziyyəti haqqında, Təhsil Nazirliyinin 0101102/102 nömrəli məktubu ilə ADPU-ya təqdim edilmiş XI sinif dərsliklərin rəyləndirilməsi haqqında məsələ və cari məsələlər daxildir.

İclasın gündəliyi yekdilliklə qəbul olunub.

Tədris Departamentinin direktor müavini, dosent Ənvər İmanov “Təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi haqqında” 30.05.2017-ci il tarixli 3/85 nömrəli əmrin icra vəziyyəti haqqında məlumat verib. Dosent Ə.İmanov bildirib ki, sürətlə modernləşən Azərbaycan Respublikasında təhsil sisteminin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi istiqamətində yeni addımların atılmasına və ümumi təhsilin keyfiyyət göstəricilərinin Avropa standartlarına uyğunlaşdırılmasına və həmin məktəblər üçün müasir tipli ali pedaqoji təhsilli müəllimlərin hazırlanmasına ehtiyac vardır. Son illərdə elmi-texnoloji tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktiki bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Əsas məqsədi ölkədə səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sistemini yaratmaq olan “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” məhz bu vəzifələrin həyata keçirilməsi üçün qəbul edilmişdir. Bu baxımdan müasir dövrün tələblərinə cavab verən yüksək intellekli pedaqoji kadrların hazırlanması prosesi olduqca məsuliyyətli və şərəfli vəzifədir. Müasir dövrdə pedaqoji kadr hazırlığının hədəfləri və məzmunu diqqətlə nəzərdən keçirilməlidir. Müəllimdən tələb olunan təkcə bilik vermək, öyrətmək deyil, eyni zamanda qarşıya çıxa biləcək müxtəlif problemlərin öhdəsindən ustalıqla gələ bilmək bacarığıdır. Bu mənada müasir müəllimdən ekstremal şəraitdə düzgün qərar vermək bacarığı tələb olunur.




İnkişaf etmiş ölkələrin bütün təhsil modellərində, ilk növbədə, müəllimin rolu müzakirə edilir. Hər şeyi bilən, məlumat ötürücü aparat kimi fəaliyyət göstərən istiqamətverici müəllimin yerini tədricən yol göstərən müəllim tutur. Təhsilalanın savadlı və səriştəli şəxs kimi formalaşmasında müəllimin akademik bacarıqları, tədris və peşəkarlıq səviyyəsi mühüm əhəmiyyət kəsb edir. Müəllimin bu keyfiyyətləri ilə təhsilalanların nailiyyətləri arasında sıx əlaqə mövcuddur. Bilik və bacarıqlarını daim zənginləşdirən müəllimlər təhsilalanların keyfiyyətli mütəxəssis kimi formalaşmasında əhəmiyyətli rol oynayırlar.

Müəllim hazırlığına verilən müasir tələblər və bu cəhətlər nəzərə alınaraq təhsil ixtisasları üzrə 2014-cü ildə təsdiq edilmiş təhsil proqramlarında (standartlarında) pedaqoji təcrübə 14 həftə müddətində IV tədris ilinin ikinci semestrində nəzərdə tutulmuşdur.

Təhsil ixtisasları üzrə mütəxəssis hazırlığının keyfiyyətinin yüksəldilməsi, praktik bilik və bacarıqların, müvafiq səriştələrin formalaşdırılması, təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodologiyasına yiyələnməsinin təmin edilməsində xüsusi yer tutan pedaqoji təcrübənin Nazirlər Kabinetinin 2008-ci il 19 sentyabr tarixli 221 nömrəli qərarı ilə təsdiq edilmiş “Ali (orta ixtisas) təhsil müəssisələri tələbələrinin ixtisas üzrə təcrübəsinin keçirilməsi haqqında Əsasnamə”yə və “Azərbaycan Dövlət Pedaqoji Universiteti üzrə tələbələrin təcrübə saatlarının bölgüsündə dəyişiklik edilməsi haqqında” Elmi Şuranın 31 may 2017-ci il tarixli iclasının qərarına və uyğun 22 iyun 2017-ci il tarixli 3/104 nömrəli əmrinə müvafiq təşkili, keçirilməsi və Nazirlər Kabinetinin 2008-ci il 19 sentyabr tarixli 221 nömrəli qərarı ilə təsdiq edilmiş “Ali (orta ixtisas) təhsil müəssisələri tələbələrinin ixtisas üzrə təcrübəsinin keçirilməsi haqqında Əsasnamə”yə və “Azərbaycan Dövlət Pedaqoji Universiteti üzrə tələbələrin təcrübə saatlarının bölgüsündə dəyişiklik edilməsi haqqında” Elmi Şuranın 31 may 2017-ci il tarixli iclasının qərarına uyğun 22 iyun 2017-ci il tarixli 3/104 nömrəli əmrinə müvafiq təşkili və keçirilməsinə başlanılmışdır.

(Davamı 2-ci səhifədə)

# Tədris-Metodiki Şuranın iclası

(Əvvəli 1-ci səhifədə)

Rəhbərlik səviyyəsində ötən tədris ilindən təhsil ixtisasları qrupunun praktik istiqamətliliyinin yüksəldilməsi istiqamətində lazımi işlər görülmüdür. Belə ki, 29.03.2017-ci il tarixdə ADPU-da Təhsil Nazirliyi və Təhsil İnstitutu ilə birgə "Universitet-ümumtəhsil məktəb əlaqələri" mövzusunda elmi-praktik tədbir keçirilmiş, ADPU-da ümumtəhsil məktəblərində nailiyyətləri ilə fərqlənən fənn müəllimlərinin ustad dərsləri təşkil edilmiş, universitet-məktəb əlaqələrinin sınaqdan çıxmış forması olan "Açıq qapı" günlərindən geniş şəkildə istifadə olunmuşdur.Təhsil Nazirliyinin təhsil ixtisasları üzrə Təhsil proqramları hazırlayan işçi qrupun rəhbərinin iştirakı ilə universitetdə çoxsaylı görüşlər təşkil edilmiş, universitet rektorunun 30.05.2017-ci il tarixdə imzaladığı "Təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi haqqında" imzaladığı 3/85 nömrəli əmrlə yeni, 2017-2018-ci tədris ili və ondan sonrakı dövr üçün fəaliyyət istiqamətləti müəyyənləşdirilmişdir.

İclasda fakültə dekanlarının təhsil ixtisasları üzrə təhsil proqramlarının praktik istiqamətliliyinin yüksəldilməsi istiqamətində fakültələrdə həyata keçirilən işlər barədə məlumatları dinlənilib və görüləcək işlər müəyyən edilib.

Təhsil Nazirliyinin 0101102/102 nömrəli məktubu ilə ADPU-ya təqdim edilmiş XI sinif dərsliklərin rəylərdirilməsi haqqında Tədris Departamentinin Metodiki xidmət və akkretitasiya bölməsinin müdiri, pedaqogika üzrə fəlsəfə doktoru Leyla Əliyeva məlumat verib. Bildirib ki, Təhsil Nazirliyinin 02.03.2018-ci il tarixli 02-08-449/15 nömrəli məktubuna əsasən 2018-



2019-cu tədris ilinə ümumtəhsil məktəblərinin XI sinifləri üçün fənlər üzrə yeni dərslik komplektləri (dərslik və müəllim üçün metodik vəsait) tərtib edilmişdir. Hazırda həmin dərslik komplektlərinin nəşrqabağı təkmilləşdirilməsi üçün onlara dair ictimai rəyin öykənilməsi prosesi gedir. Bu məqsədlə dərslik komplektlərinin layihələri www.trims.edu.az saytının "İctimai müzakirə" bölməsində yerləşdirilir. Bütün dərslik komplektlərinin layihələri yaxın günlərdə sayta yerləşdiriləcəkdir. Saytın "İctimai müzakirə" bölməsinə daxil olaraq istənilən fənn üzrə dərslik komplektinin layihəsini onlayn oxumaq və kompüterə yükləmək, eyni zamanda xüsusi ayrılmış sahədə irad və təklifləri yazmaq mümkündür. Universitetin fakültələrinin profilini və mövcud təcrübəsini nəzərə alaraq XI sinif dərslik komplektlərinin ictimai müzakirəsinin təşkil olunması, müvafiq irad və təkliflər bildirmək məqsədilə 15.03.2018-ci il tarixində fakültələrin koorperativ elektron ünvanlarına məktub göndərilmişdir. Təhsil Nazirliyinin məktubuna müvafiq olaraq XI sinif dərslik komplekti mümkün qədər qısa müddətdə, yəni 27.04.2018-ci il tarixdən gec olmayaraq dərslik@edu.gov. elektron poçtuna göndərilməli və rəsmi qaydada Təhsil Nazirliyinə təqdim edilməsi nəzərdə tutulub. Təhsil Nazirliyinin tələblərinə uyğun olaraq dərslik komplektlərinin layihələrinə münasibət bildirərkən ümumi sözlərdən istifadə edilməməli, təklif və iradlar konkret faktlara istinadən yazılmalıdır.

Bu məsələ ilə bağlı müvafiq ixtisas kafedralarının müdirlərinin məlumatları dinlənilib və fakültələrdə dərslik komplektlərinə rəy verəcək müəllimlər müəyyən edilib.

Riyazi analiz kafedrasının professoru Malik Cəbrayılov, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, Riyaziyyat və informatika fakültəsinin dekanı, dosent Maqsud Nəcəfov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Fizika və texnologiya fakültəsinin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov, İbdidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağrışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova, Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyev, Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti Fəxrəddin Yusifov çıxış edərək tədris planlarının dəyişdirilməsi, fənn proqramlarının sadələşdirilməsi, pedaqoji fəaliyyətdə qabaqcıl beynəlxalq təcrübədən istifadə edilməsi, nəzəriyyə ilə əməli fəaliyyətin əlaqələndirilməsi ilə bağlı fikir və təkliflərini bölüşüblər.

İclasda Tədris Departamentinin Planlaşdırma və proqnozlaşdırma bölməsinin müdiri, pedaqogika üzrə fəlsəfə doktoru Qəmər İsayeva cari məsələlər barədə məlumat verib. Cari məsələlərdə kafedralar tərəfindən təqdim olunan əsas fənn blokuna aid olan dərs vəsaitləri, seçmə fənlər üzrə proqram və dərsliklərin, təsdiqi haqqında məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

**Orxan Abdullayev**

# Ali məktəb tələbələrinin ümummilli lider Heydər Əliyevin anadan olmasının 95-ci ildönümünə həsr olunmuş bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi

Mayın 10-da müasir Azərbaycanın qurucusu, ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü tamam olur. Ulu öndərimiz Heydər Əliyevin anadan olmasının 95-ci ildönümü münasibətilə və Onun xatirəsinə ehtiram əlaməti olaraq respublikamızın ali, orta və ilk peşə-ixtisas təhsili müəssisələrinin tələbə və şagirdləri arasında bədii yaradıcılıq festivalı keçirilir. Bədii yaradıcılıq festivalı Təhsil Nazirliyi (TN) və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİRK) birgə müvafiq qərarı əsasında keçirilir. Bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsəd tələbə-gəncləri milli vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək, onların bədii-estetik səviyyəsini yüksəltmək, mədəni həyat tərzinin formalaşdırılması işinə kömək etmək, həmçinin incəsənət və mədəniyyətimizin ayrı-ayrı sahələri üzrə istedadlı gənclərin üzə çıxarılaraq onların qabiliyyətlərinin inkişaf etdirilməsinə dəstək verməkdir. Festivalın keçirilməsi üçün 8 nəfərdən ibarət Təşkilat Komitəsi və tərkibinə xalqımızın tanınmış incəsənət və mədəniyyət xadimlərinin daxil edildiyi 10 nəfərdən ibarət Münsiflər Heyəti yaradılıb.

Aprelin 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) universitetin tələbələrinin iştirakı ilə bədii yaradıcılıq festivalının baxış-müsabiqəsi keçirilib. Festivalın baxış-müsabiqəsində ADPU-nun tələbə-gənclərinin yüksək səviyyədə ifa etdikləri rəngarəng şeir və musiqi nömrələri diqqəti cəlb edib. Məlumat üçün bildirək ki, festival qaliblərinin yekun konsertinin may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur. Qeyd edək ki, qaliblər Təhsil Nazirliyinin və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin diplom və hədiyyələri, mükafatları ilə təltif ediləcəklər.

# Hüseyn Cavidin həyat və yaradıcılığına həsr olunmuş bədii qiraət müsabiqəsi



Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2017-ci il oktyabr ayının 24-də "Böyük Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin 135 illik yubileyinin keçirilməsi haqqında" Sərəncam imzalayıb. Təhsil Nazirliyi tərəfindən bu Sərəncamla əlaqədər yanvarın 11-də müvafiq əmr verilib. Yuxarıda qeyd edilən sənədlərə əsasən Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) imzalanmış əmrlə "Böyük Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin 135 illik yubileyinin keçirilməsi ilə əlaqədər Fəaliyyət Planı" təsdiq edilib. Fəaliyyət Planına uyğun olaraq ADPU-da həyata keçiriləcək tədbirlər müəyyən edilib. Fəaliyyət planında ADPU-da "Hüseyn Cavid və çağdaş Azərbaycan filologiyası" mövzusunda elmi konfransın keçirilməsi və konfrans çərçivəsində dramaturqun həyat və yaradıcılığını əks etdirən ədəbi-bədii kompozisiyanın təqdimatı və fotosərginin təşkili, Hüseyn Cavidin 135 illik yubileyi ilə bağlı aparılan elmi-tədqiqatların nəticələrinin ADPU-nun dövri elmi nəşrlərində dərc edilməsi, "Hüseyn Cavid XX əsr Azərbaycan mütərəqqi romantizminin banilərindən biri kimi" mövzusunda mühazirənin təşkili, tələbələr arasında Hüseyn Cavidin həyat və yaradıcılığına həsr olunmuş bədii qiraət müsabiqəsinin keçirilməsi öz əksini tapıb. Aprelin 18-də universitetdə Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Hüseyn Cavidin həyat və yaradıcılığına həsr olunmuş bədii qiraət müsabiqəsi keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Filologiya fakültəsinin müəllim və tələbələri, həmçinin ADPU-da keçirilən "Açıq qapı günləri" layihəsi çərçivəsində Bakı şəhəri 245 nömrəli tam orta məktəbin şagirdləri iştirak ediblər.

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxış edərək bildirib ki, Hüseyn Cavidin dramaturgiyası XX əsr Azərbaycan romantizminin ən səviyyəli nümunəsi olmaqla yanaşı, dünya romantizminin əlamətlərinə də malikdir. Bir sıra janrları, xüsusən sonet, xalq musiqisini və marşları Azərbaycan şeirinə ilk dəfə Hüseyn Cavid gətirmişdir. O, yaradıcılığında monoloq və dialoqlardan məharətlə istifadə etmişdir. Hüseyn Cavid zəngin yaradıcılıq irsi qoyub getmişdir. Qüdrətli söz üstadı, böyük mütəfəkkir Hüseyn Cavid dünyanın müqəddəs dəyərləri olan həqiqəti, gözəlliyi və məhəbbəti vəhdətdə tərənnüm etmişdir. Hüseyn Cavid Türk dünyasının, eləcə də bütün dünyanın tanınan, sayılıb-seçilən yazıçılarından biridir. Onun əsərləri dünyanın müxtəlif dillərinə tərcümə olunub. Hüseyn Cavid bizim müasirimizdir, onun əsərləri həmişə sevilə-sevilə, böyük maraqla oxunacaq.

Tədbirdə Hüseyn Cavidin həyat və yaradıcılığına həsr olunmuş slayd nümayiş etdirilib.

Tədbirdə çıxış edən ADPU-nun Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, bədii qiraət ustası, Əməkdar artist Ağalar Bayramov universitetdə Hüseyn Cavidin xatirəsinin anılmasını yüksək qiymətləndiriblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bədii qiraət müsabiqəsinin keçirilməsini çox əhəmiyyətli bir hadisə kimi dəyərləndirib. Qeyd edib ki, xalqımızın böyük tarixi şəxsiyyətləri çoxdur. Onların arasında Hüseyn Cavid xüsusi yer tutur. Hüseyn Cavid xalqımızın milli sərvətidir. Belə dahi şəxsiyyətlər bizim üçün yüksək zirvədir. Biz bu sərvətlərimizə sahib çıxmalıyıq. Ulu öndərimiz Heydər Əliyev Hüseyn Cavidin şəxsiyyətinə və yaradıcılığına yüksək qiymət verib. Qədirbilən xalqımız onun xatirəsini əziz tutur. Rektor çıxışının sonunda tədbirin təşkilatçılarına təşəkkür edib və uğurlar arzulayıb.

Bədii qiraət müsabiqəsində tələbələr və şagirdlər Hüseyn Cavidin şeirlərini, əsərlərindən parçaları, şairin sözlərinə yazılmış mahnıları və müxtəlif rəqsləri ifa ediblər. Onların çıxışları iştirakçılar tərəfindən maraqla və alqışlarla qarşılanıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Nigar Abbasova**

# PETRA layihəsi çərçivəsində öyrənilmiş Avropa təcrübəsi ilə bağlı təqdimat

*Aprelin 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) PETRA layihəsi çərçivəsində keyfiyyətin təminatı sahəsinə dair öyrənilmiş Avropa təcrübəsi ilə bağlı təqdimat keçirilib. Təqdimatda ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müvafiq şöbələrin müdirləri və müəllimlər iştirak ediblər.*

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq universitetin tərəfdaşlarından biri olduğu PETRA layihəsi çərçivəsində tədris və təlim, keyfiyyətin təminatı ilə bağlı müasir Avropa təcrübəsinin öyrənilməsinin əhəmiyyətindən danışıb. Rektor qeyd edib ki, sözügedən layihə çərçivəsində əməkdaşlarımızın xarici təcrübəni öyrənmək imkanı əldə etmələri müsbət haldır. Beynəlxalq layihələrin hazırlanması və həyata keçirilməsi ilə bağlı işləri daha da inkişaf etdirmək, universitetdə bütün sahələrdə keyfiyyətin təmin olunmasına şərait yaradan müasir təcrübəni tətbiq etmək olduqca faydalıdır.



ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov çıxış edərək ali təhsil müəssisələrinin daha da inkişaf etməsində layihələrin, xüsusilə də, beynəlxalq layihələrin özünəməxsus yer tutduğunu vurğulayıb. Bildirib ki, bu cür layihələr universitetin zamanın tələblərinə uyğun istiqamətdə inkişaf etməsinə, yeniliklərin tətbiqinə, müasir Avropa ali təhsil məkanına inteqrasiya etməsinə öz töhfəsini vermiş olur.

Sonra ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov tərəfdaşlarından biri olduğumuz "Azərbaycan universitetlərində tədris və təlimin təkmilləşdirilməsi" (Promoting Excellence in Teasching and Learning in Azerbaijani Universities - PETRA) layihəsi çərçivəsində keyfiyyətin təminatı ilə bağlı öyrənilmiş Avropa təcrübəsi haqqında təqdimat nümayiş etdirib. O, layihə çərçivəsində keçirilmiş görüşlər haqqında, xüsusilə ötən ilin noyabr ayında baş tutmuş Ankara səfəri və mart ayında reallaşmış Avstriya səfəri haqqında məlumat verib.

Vurğulayıb ki, layihə üzrə 5-9 mart 2018-ci il tarixlərində Avstriyanın Vyana şəhərində yerləşən Vyana Tətbiqi Elmlər Universitetində (University of Applied Sciences bfi Vienna) keçirilmiş sonuncu görüşdə onunla bərabər universitetin Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Günay Məhərrəmova yerli və avropalı tərəfdaş ali məktəblərin nümayəndələri ilə birlikdə təlimdə iştirak ediblər. R.Sadıqov layihənin mahiyyəti, tərəfdaşları, onun əsas məqsədləri və gözlənilən nəticələr, keyfiyyətin təmin olunmasında mühüm rol oynayan amillər, o cümlədən, ali məktəbdə özünüqiymətləndirmənin, müxtəlif məmnunluq sorğularının keçirilməsi haqqında geniş danışıb.

5 gün davam edən təlimdə Avstriyada tədqiqat və inkişaf sistemi, maliyyələşmə, tədrislə tədqiqatın əlaqəsi, keyfiyyətin təminatı və idarə olunması və s. haqqında təqdimatlar nümayiş etdirilib, müzakirələr aparılıb. Qeyd olunanları nəzərə alaraq, sözügedən layihə çərçivəsində indiyədək keçirilmiş görüşlərdə tədris, təlim və keyfiyyətin təminatı sahəsində öyrənilmiş müasir Avropa təcrübəsinin universitetin inzibati və akademik heyətinə təqdim olunmasının faydalılığı diqqətə çatdırılıb. R.Sadıqov xarici səfərlərdə iştiraka şərait yaratdığına görə universitetin rektoru, professor Cəfər Cəfərova və layihənin koordinatoru, Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadəyə öz təşəkkürünü bildirib.

Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev,Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov çıxış edərək təqdimatın keçirilməsini yüksək qiymətləndirərək öz fikir və təkliflərini bölüşüblər.

Rektor Cəfər Cəfərov təqdimata yekun vuraraq gələcəkdə də bu cür tədbirlərin ke-



# ADPU ilə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Tarix fakültəsi arasında əməkdaşlıq haqqında müqavilə imzalanıb

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təhsilin keyfiyyətinin yüksəldilməsi, professor-müəllim heyətinin və əməkdaşların bilik və peşəkarlıq səviyyəsinin artırılması ilə yanaşı, dünyanın nüfuzlu ali təhsil müəssisələri ilə əlaqələrin yaradılmasına, elmin müxtəlif sahələrində çalışan tanınmış alim-mütəxəssislərin bilik və təcrübəsinin öyrənilməsinə, onlarla fikir mübadiləsinin aparılmasına böyük önəm verilir. Bu baxımdan, aprelin 23-də M.V. Lomonosov adına Moskva Dövlət Universitetinin (MDU) Tarix fakültəsinin dekanı, tarix elmləri doktoru, professor İvan Tuçkovun, həmin fakültənin dekan müavini və elmi katibi, tarix elmləri namizədi, dosent Oksana Solopovanın, tarix elmləri namizədi, həmin fakültənin Yaxın xarici ölkələr tarixi kafedrasının dosenti İsmayıl Ağakişiyevin ADPU-ya səfərə gəlməsini xüsusi qeyd edə bilərik. Səfər zamanı qonaqlar əvvəlcə Rusiya Federasiyasının Azərbaycandakı səfirliyində, MDU-nun Bakı Filialında görüşlər keçiriblər. Sonra qonaqlar ADPU-ya gələrək universitetin rəhbərliyi və müəllimləri ilə görüşüblər.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq onları rəhbərlik etdiyi universitetdə görməkdən məmnunluq duyduğunu bildirib. Qeyd edib ki, M.V. Lomonosov adına MDU dünyanın tanınmış və nüfuzlu ali təhsil müəssisələrindən biridir. Bu gün ADPU ilə MDU-nun Tarix fakültəsi arasında əməkdaşlığın əsası qoyulur. ADPU-nun qarşıdan 100 illik yubileyi gəlir. Universitet böyük və zəngin elm və təhsil ənənələrinə malikdir. ADPU-nun bir neçə müəllimi MDU-nun məzunudur. MDU-nun Tarix fakültəsi ilə əməkdaşlıq haqqında müqaviləni imzalamaqla universitet öz beynəlxalq əlaqələrini daha da genişləndirir. Bu müqavilənin uğurla həyata keçirilməsində Tarix və coğrafiya fakültəsinin üzərinə mühüm məsuliyyət düşür. Rektor çıxışının sonunda əməkdaşlığın hər iki tərəf üçün faydalı olacağını vurğulayıb.

MDU-nun Tarix fakültəsinin dekanı, professor İvan Tuçkov çıxış edərək səmimi və mehriban münasibətə görə təşəkkür edib. Bildirib ki, müəllim hazırlığı hər bir ölkə üçün müstəsna əhəmiyyət kəsb edir. Bu baxımdan, ADPU-nun üzərinə böyük məsuliyyət düşür. ADPU-da aparılan islahatlar təhsilin kefiyyətinin yaxşılaşdırılmasına və yüksəkixtisaslı pedaqoji kadr hazırlığına xidmət edir. ADPU ilə əməkdaşlıq haqqında müqavilənin imzalanması mühüm hadisədir. Bu müqavilə qarşılıqlı anlaşmaya, bərabərliyə və hörmətə əsaslanır. Professor İvan Tuçkov əməkdaşlıq müqaviləsinin uğurla həyata keçiriləcəyini qeyd edib.

Daha sonra əməkdaşlıq haqqında müqavilə imzalanıb. İmzalanmış müqavilədə qarşılıqlı maraq kəsb edən birgə elm və təhsil layihələrinin gerçəkləşdirilməsi, dünya əhəmiyyətli problemlərlə bağlı müştərək elmi konfransların, simpoziumların, seminarların təşkili və keçirilməsi, akademik mobilliyin inkişafı, tələbə və müəllim mübadiləsi, informasiya, elmi nəşrlərin və tədris-metodiki ədəbiyyatın mübadiləsi nəzərdə tutulub.



MDU-nun Tarix fakültəsinin dekan müavini və elmi katibi, dosent Oksana Solopova, həmin fakültənin Yaxın xarici ölkələr tarixi kafedrasının dosenti İsmayıl Ağakişiyev, ADPU-nun Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova, dosenti İradə Qasımova, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağrışaqədər hazırlığı fakültəsinin dekanı, dosent Laçın Həsənova çıxış edərək imzalanmış müqaviləni yüksək qiymətləndiriblər və hər iki tərəfə uğurlar arzulayıblar.

Görüşdə həm də MDU-nun məzunlarının təşkilati dəstəyi ilə rusiyalı və azərbaycanlı tarixçilərin Assosiasiyasının yaradılması müzakirə edilib və bu qurumun yaradılması məqsədəuyğun sayılıb. Mərasimdə həmçinin orta məktəblərin tarix müəllimləri üçün Rusiya-Azərbaycan münasibətlərinin ümumi tarixinə dair metodik tövsiyələrin layihəsi müzakirə edilib.

Sonda qonaqlara universitetin hədiyyələri təqdim edilib, xatirə şəkli çəkdirilib.

Aprelin 24-də isə professor İvan Tuçkovun ADPU-da "Əbədi şəhərin yolları" mövzusunda mühazirəsi keçirilib.

Qeyd edək ki, səfər zamanı qonaqlar ADA Universitetində, Heydər Əliyev Mərkəzində, Azərbaycan Tarixi Muzeyində, Müasir İncəsənət Muzeyində, Azərbaycan Elmi-tədqiqat Üzümçülük və Şərabçılıq İnstitutunun Muzeyində olublar. Səfər çərçivəsində iştirakçıların Azərbaycanın tarixi və mədəni yerləri ilə tanışlığı da təşkil edilib.

**Mənsur İbrahimli**

# Görkəmli pedaqoq-alim Sabir Quliyevin 80 illik yubileyinə həsr olunmuş elmi-nəzəri konfrans

Aprelin 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlıq fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə görkəmli pedaqoq-alim, pedaqoji elmlər doktoru, professor Sabir Quliyevin 80 illik yubileyinə həsr olunmuş elmi-nəzəri konfrans və "Musiqi pedaqogikasına həsr olunmuş şərəfli ömür" kitabının təqdimatı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, tanınmış alimlər, incəsənət xadimləri, ziyalılar iştirak ediblər.







Konfransı giriş sözü ilə açan Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Laçın Həsənova bildirib ki, professor Sabir Quliyevin adı ölkəmizin musiqi-pedaqoji ictimaiyyətinə yaxşı tanışdır. Onun respublikamızda ilk dəfə "Musiqi müəllimliyi" ixtisasının yaranmasında, musiqi pedaqogikasının inkişafında, ümumtəhsil məktəbləri üçün milli musiqi kadrlarının hazırlanması sahəsində mühüm xidmətləri olub. S.Quliyevə həsr edilmiş "Musiqi pedaqogikasına həsr olunmuş şərəfli ömür" kitabına onunla birgə çalışmış həmkarlarının, dostlarının və ailə üzvlərinin xatirələri daxil edilib. Kitabın redaktoru sənətşünaslıq üzrə fəlsəfə doktoru, "Humay" mükafatı laureatı, professor Zemfira Abdullayevadır.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında qeyd edib ki, bu gün universitet növbəti dəfə öz vəfa borcunu yerinə yetirir. Universitetin inkişafında xidmətləri olmuş professor S.Quliyevin 80 illik yubileyinə həsr olunmuş elmi-nəzəri konfrans və "Musiqi pedaqogikasına həsr olunmuş şərəfli ömür" kitabının təqdimatı keçirilir. Ulu öndər Heydər Əliyev Azərbaycanda elm və təhsil xadimlərinə, yazıçılara, şairlərə, ziyalılara dəyər verilməsinin ənənəsini qoyub. Həyatda dərin iz qoymuş insanlara layiq olduqları qiymətin verilməsi böyük mənəvi əhəmiyyət kəsb edir. Bu baxımdan, bugünkü tədbir təqdirəlayiqdir. Rektor çıxışının sonunda tədbirin təşkilatçılarına təşəkkür edib.

"Musiqi pedaqogikasına həsr olunmuş şərəfli ömür" mövzusunda məruzə ilə çıxış edən Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva professor S.Quliyevin həyat yolu və elmi-pedaqoji fəaliyyəti barədə məlumat verib. Bildirib ki, S.Quliyev 1938-ci il aprel ayının 3-də Bakının Bülbülə kəndində anadan olub. 1969-cu ildə Azərbaycan Dövlət Konservatoriyasını müvəffəqiyyətlə bitirib. 1970-ci ildən həyatını ADPU ilə bağlayan S.Quliyev burada müəllim, baş müəllim, dosent, kafedra müdiri, professor vəzifələrində çalışıb. 1973-cü ildə "Məktəblilərdə müasir və klassik musiqiyə marağın formalaşması" mövzusunda dissertasiya müdafiə edərək, pedaqoji elmlər namizədi alimlik dərəcəsi alıb. Professor S.Quliyevin 40 illik elmi-pedaqoji fəaliyyətinin, yaradıcılığının əsasını milli musiqi vasitəsilə musiqi tərbiyəsi problemləri təşkil edir. Ümumtəhsil, orta ixtisas və ali təhsil müəssisələrində tədris prosesi zamanı milli musiqidən istifadə məsələləri, problemləri ilə ciddi məşğul olmuş, konkret elmi-pedaqoji nəticələr əldə etmiş professor S.Quliyev Azərbaycan musiqi pedaqogikasının əsasını qoyanlardan biridir. O, bir çox elmi konfrans və simpoziumlarda Azərbaycanı layiqincə təmsil edib. 1996-cı ildə "Məktəblilərin musiqi tərbiyəsində Azərbaycan musiqisindən istifadənin nəzəriyyəsi və təcrübəsi" mövzusunda doktorluq dissertasiyasını müdafiə edərək, pedaqoji elmlər doktoru alimlik dərəcəsi alıb. S.Quliyev Azərbaycanda "Musiqi" fənninə dair ilk proqram və ilk "Musiqi" dərsliklərinin müəlliflərindən biri olub. Musiqi pedaqogikası sahəsində elmi kadrların yetişdirilməsi daim onun diqqət mərkəzində olub. 1982-ci ildən ömrünün sonuna kimi Musiqi alətləri kafedrasının müdiri olub. 2001-ci ildə vəfat edib. Bu gün təməli professor S.Quliyev tərəfindən qoyulmuş kafedra yüksək elmi potensiala malikdir. Görkəmli alim, pedaqoq, alicənab insan olan S.Quliyevin əziz xatirəsi onu sevənlərin qəlbində daim yaşayacaq.

Tədbirdə millət vəkili Ağacan Abiyev, professor Fərrux Rüstəmov, professor Minarə Dadaşova, professor Tamilla Kəngərlinskaya, professor Oqtay Rəcəbov, professor Vidadi Xəlilov, professor Vamiq Məmmədəliyev çıxış edərək professor S.Quliyevlə bağlı xatirələrini bölüşüb, alimin elmi-pedaqoji fəaliyyətini yüksək qiymətləndiriblər.

Professor S.Quliyevin qardaşı Nizami Quliyev çıxış edərək tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə və bu işdə əməyi keçən hər kəsə təşəkkür edib.

# "Yuxarı ellərdə səyyah bir dərviş: Yunis Əmrə" mövzusunda elmi konfrans

Aprelin 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Türkiyə Respublikasının Baş Nazirliyinin Türk Əməkdaşlıq və Koordinasiya Agentliyinin (TİKA) birgə təşkilatçılığı ilə "Yuxarı ellərdə səyyah bir dərviş: Yunis Əmrə" mövzusunda elmi konfrans keçirilib. Konfransın keçirilməsində məqsəd Azərbaycan və Türkiyə arasında mədəni əlaqələrin inkişaf etdirilməsi, ortaq mədəniyyətimizin tarixi şəxsiyyətlərinin gənc nəsillərə öyrədilməsi və tanıdılmasıdır. Konfransda ADPU-nun rəhbərliyi, müəllimləri, magistrantları, doktorantları və tələbələri iştirak ediblər.



Konfransı giriş sözü ilə açan ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov bildirib ki, universitet beynəlxalq əlaqələrin genişləndirilməsi sahəsində səmərəli fəaliyyət göstərir. Türkiyə ilə əlaqələrin genişləndirilməsinə xüsusi diqqət yetirilir.Ulu öndərimiz Heydər Əliyevin dediyi kimi "Biz bir millət, iki dövlətik". Bu gün ADPU-da bu istiqamətdə növbəti uğurlu addım atılır. TİKA iqtisadiyyat, sosial, mədəniyyət, təhsil, kənd təsərrüfatı, səhiyyə, dövlət idarəçiliyi və bir çox sahələrdə texniki əməkdaşlıq və yardım fəaliyyəti göstərir. Azərbaycan və Türkiyə arasında əlaqələrin inkişafına dəstək verən TİKA-nın fəaliyyətinin əsas istiqamətlərindən biri ortaq tarixi dəyərlərimizin yaşadılmasıdır. Professor A.Zamanov çıxışının sonunda konfransın işinə uğurlar arzulayıb.



Konfransın moderatoru, Türk araşdırmaları elmi-tədqiqat laboratoriyasının rəhbəri, professor Elman Quliyev bildirib ki, Yunis Əmrə Türk dünyasının böyük şəxsiyyəti, qüdrətli sənətkarı, görkəmli mütəfəkkiridir. Yunis Əmrə yaradıcılığında İslam ideologiyası mərkəzi yer tutur. Onun yaradıcılığı mövzu baxımından çox zəngindir. Yunis Əmrə Türk xalqlarının ictimai-siyasi və ədəbi-fəlsəfi fikir tarixinin görkəmli nümayəndələrindən biridir. O, böyük mənəviyyat, ruh, düşüncə sahibidir. Yunis Əmrənin yaradıcılığı bizim mənəvi cəhətdən zənginləşməyimizə kömək edir.

Yunis Əmrə irsinin tədqiqatçısı, Türkiyənin Qazi Universitetinin professoru Mustafa Tatcı və yazıçı Leyla İpəkçi konfransın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Onlar çıxışlarında Türkiyə-Azərbaycan münasibətlərinin yüksək səviyyədə inkişaf etməsindən məmnunluq duyduqlarını bildiriblər. Çıxışçılar Yunis Əmrənin həyat və yaradıcılığı haqqında ətraflı məlumat veriblər.

Konfransın sonunda Türk xalqlarının ədəbiyyatı sahəsində göstərdiyi xidmətlərə görə professor Mustafa Tatcı və yazıçı Leyla İpəkçiyə ADPU rəhbərliyinin hədiyyələri təqdim edilib. Eyni zamanda TİKA-nın Bakı proqram koordinatoru Adəm Urfa tərəfindən Türk xalqlarının ədəbiyyatı sahəsində göstərdiyi xidmətlərə görə professor Elman Quliyevə hədiyyə təqdim edilib.

Konfransdan sonra qonaqlar TÜRKSOY kafedrası və Türk araşdırmaları elmi-tədqiqat laboratoriyası ilə tanış olublar.

**Nurlan Səmədov**



# ADPU-nun əməkdaşları Qars Qafqaz Universitetində keçirilən Elm və mədəniyyət festivalında iştirak ediblər

Aprelin 16-18-də Qars Qafqaz Universitetinin təşkilatçılığı ilə Azərbaycanın, Naxçıvanın, Gürcüstanın, Özbəkistanın, Qazaxıstanın, Rusiyanın müxtəlif universitetlərinin, həmçinin Təbriz Dövlət Universitetinin professor-müəllim heyətinin iştirakı ilə Qars Qafqaz Universitetində Elm və mədəniyyət festivalı keçirilib. Coğrafi mövqe baxımından Ön Asiyanın Türkiyəyə giriş qapısında yerləşən Qars Qafqaz Universitetində keçirilən festivalda Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin dekanı, fizika üzrə fəlsəfə doktoru, dosent Arzu Daşdəmirov, Coğrafiya və tarix fakültəsinin Azərbaycan tarixi kafedrasının müdiri, tarix üzrə fəlsəfə doktoru, dosent Naibə Əhmədova, Əcnəbi tələbələrlə iş şöbəsinin müdiri Aynurə Əsgərova iştirak ediblər.



3 gün davam edən festivalda iştirakçı universitetlərin rektorları və nümayəndə heyətlərinin çıxışları, Qars Qafqaz Universitetinin təqdimat filmi, rəsm sərgisi, musiqi dinləmələrindən sonra "Mədəniyyətlərarası əlaqələr" və "Mədəni siyasət" mövzularında bölmə dinləmələri keçirilib. Festivalın ikinci günü Qafqaz Universitetləri nümayəndə heyətlərinin iş birliyi toplantısı keçrilib, sonra festival mədəni tədbirlərlə öz işini davam etdirib.

Festivalda həmçinin Qars, Təbriz, Naxçıvan və Gürcüstan musiqi qrupları musiqilər ifa ediblər. Festival Heydər Əliyev Təhsil Mərkəzi, Qars Harakani Mədəniyyət Mərkəzi, Qafqaz Hərb Tarixi Muzeyi, Ani şəhər xarabalıqlarına ziyarətlə öz işini başa çatdırıb. Qeyd edək ki, bu tədbir ADPU ilə Qars Qafqaz Universiteti arasında elmi və mədəni əlaqələrin inkişafına, müəllim və tələbə mübadiləsinə xidmət edəcək.

# Bakının "Ekspo 2025" Ümumdünya Sərgisinə ev sahibliyinə namizəd şəhər olması ilə bağlı təqdimat

Aprelin 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bakının "Ekspo 2025" Ümumdünya Sərgisinə ev sahibliyinə namizəd şəhər olması ilə bağlı təqdimat keçirilib. Tədbirdə Gənclər və İdman Nazirliyinin Beynəlxalq




standartların tətbiqi bölməsinin müdiri, Ekspo səhiyyə mövzusunun eksperti Məryəm Qafarzadə, Təhsil Nazirliyinin sektor müdiri, fəlsəfə doktoru, dosent, Ekspo təhsil mövzusunun eksperti Cəsarət Valehov, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin Məşğulluq və demoqrafiya şöbəsinin müdir müavini, Ekspo məşğulluq mövzusunun eksperti Rəna Abdullayeva iştirak ediblər. Tədbirdə Azərbaycanın "Ekspo 2025" Ümumdünya Sərgisinə namizədliyini irəli sürməsi istiqamətində görülən işlər və atılacaq addımlar barədə məlumat verilib.

Tədbiri ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev açaraq bildirib ki, Azərbaycan siyasi cəhətdən sabit və daim inkişaf edən ölkədir. Azərbaycan mötəbər beynəlxalq tədbirlərə yüksək səviyyədə ev sahibliyi edir. Artıq ölkəmiz dünya miqyaslı tədbirlərin uğurla həyata keçirildiyi bir məkana çevrilib. Bu baxımdan, Bakının "Ekspo 2025" namizəd şəhər olması təbiidir. Azərbaycanda bu sahədə qazanılmış böyük təcrübə ölkəmizin bu tədbiri də lazimi səviyyədə keçirə biləcəyinə zəmin yaradır.

Tədbirdə Məryəm Qafarzadə "Səhiyyənin gələcəyi" mövzusunda təqdimatla çıxış edib. Bildirib ki, insan kapitalını inkişaf etdirmək daha yaxşı gələcək qurmaq arzumuzu gerçəkləşdirə bilər. İnsan kapitalının inkişafı hər bir fərdə, cəmiyyətə, eyni zamanda ölkəyə öz müsbət təsirini göstərəcək. Yaradıcılığımız və biliklərimiz, istedad və təcrübəmiz, amalımız və arzularımız ilə insan kapitalı bizim birgə potensialımızdır. "Bakı Ekspo 2025" cəmiyyətin hər bir sahəsinin insan intellektindən faydalanmasına, əldə olunan biliklərin tətbiqinin öyrənilməsinə əlverişli şərait yaradacaq. İşləmək bacarığı, uzun, mənalı və sağlam




ömür sürmək hər bir insanın haqqı və gələcək nailiyyətlərinin bünövrəsidir. "Bakı Ekspo 2025" insan sağlamlığının möhkəmləndirilməsi və yeniliklərin mənimsənilməsi istiqamətində mühüm addım olacaq.

"Təhsilin gələcəyi" mövzusunda təqdimatla çıxış edən Cəsarət Valehov bildirib ki, həyatda imkanlar sonsuzdur, lakin onların hər birinə yalnız təhsilin inkişafı, istedadın üzə çıxması və biliklərin mənimsənilməsi ilə nail olmaq mümkündür. "Bakı Ekspo 2025" təhsil vasitəsilə insan kapitalından maksimal dərəcədə yararlanmağın yollarına dair qlobal anlaşma əldə etmək üçün şərait yaradacaq.

Rəna Abdullayeva "Məşğulluğun gələcəyi" mövzusunda təqdimatında bildirib ki, insan çalışdığı hər bir sahədə inkişafa və səmərəli nəticənin əldə olunmasına can atır. Lakin müasir dövrdə əksər sahələrin avtomatlaşdırıldığı bir zamanda, işçi qüvvəsinin gələcək inkişafı barədə necə danışmaq olar? "Bakı Ekspo 2025" şəxsi, cəmiyyət və qlobal səviyyədə davamlı nailiyyətlərin əldə olunması üçün mühüm müzakirələrin aparılacağı məkana çevriləcək.

Tədbirdə maraqlı müzakirələr aparılıb, fikir və təkliflər səsləndirilib, tələbə-gənclərin sualları cavablandırılıb.

Sonda ADPU-nun SABAH qruplarının koordinator rəhbəri Lalə Mürsəlbəyova mariflәndirmə xarakterli tədbirin keçirilməsinə görə təşkilatçılara təşəkkür edib.

**Könül Nəzərova**
**Mahirə Mustafayeva**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsində Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100 illiyinə həsr olunmuş dəyirmi masa

**Aprelin 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının təşkilatçılığı ilə Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100 illiyinə həsr olunmuş dəyirmi masa keçirilib. Əvvəlcə tədbirdə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.**



Tədbiri fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva açaraq iştirakçıları salamlayıb və Azərbaycan Xalq Cümhuriyyətinin yaranması haqqında məlumat verib.

Tədbirdə III tədris ili tələbələrinin Azərbaycan Xalq Cümhuriyyətinin yaranma tarixi haqqında hazırladıqları videoçarx izlənilib. Toplantıda Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov və Ümumi psixologiya kafedrasının müdiri, professor Ramiz Əliyev geniş məruzə ilə çıxış ediblər.

Fakültənin II tədris ili tələbələri Zinyət Əliyeva, Əsmər Tağıyeva, III tədris ili tələbələri Xalidə Baxışəliyeva, İlahə Əliyeva, Gülsüm İsmayılova, Göyçək Qəhrəmanova, Mahizə Əliyeva və Pərvanə Abdulovanın Azərbaycan Xalq Cümhuriyyəti haqqında hazırladıqları çıxışlar dinlənilib və slaydlar izlənilib.

Sonda fakültənin dekanı Şəhla Əliyeva müstəqil Azərbaycan Respublikasının üçrəngli bayrağının bu gün vüqarla dalğalanmasını dövlət başçımız cənab İlham Əliyevin yürütdüyü siyasətin təntənəsi kimi vurğulayaraq hamıya uğurlar arzulayıb.

# Riyaziyyat və informatika fakültəsində Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi ilə bağlı tədbir

**Aprelin 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Riyaziyyat və informatika fakültəsində Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi ilə bağlı tədbir keçirilib. Tədbirdə fakültənin müəllimləri və tələbələri iştirak ediblər.**

Tədbiri giriş sözü ilə fakültənin dekanı, professor Maqsud Nəcəfov açıb. Professor Maqsud Nəcəfov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev



2017-ci il may ayının 16-da Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında Sərəncam imzalayıb. Sərəncamda Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinin dövlət səviyyəsində



geniş qeyd edilməsi öz əksini tapıb. Təhsil Nazirliyi tərəfindən Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinin keçirilməsi barədə müvafiq əmr verilib. ADPU-da Azərbaycan Xalq Cümhuriyyətinin bu böyük tarixi yubileyinin qeyd edilməsi barədə əmr imzalanıb. Bizim bugünkü tədbirimiz də yuxarıda qeyd etdiyimiz sənədlərə uyğun olaraq keçirilir.

Tədbirdə Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının dosenti Eldar Hacıyev geniş məruzə ilə çıxış edib. Dosent Eldar Hacıyev qeyd edib ki, Azərbaycan Xalq Cümhuriyyətinin yaradılması və onun 23 aylıq hakimiyyəti dövrü xalqımızın milli tarixi üçün mühüm əhəmiyyət kəsb edir. Azərbaycan Xalq Cümhuriyyəti qısa vaxtda öz dövlət atributlarını, parlamentini, ordusunu və pul vahidini yaratdı. Azərbaycan Xalq Cümhuriyyəti yeni yaranmış milli respublikalar arasında ən demokratik respublika idi. Dünyada ilk dəfə Azərbaycanda qadınlara seçmək və seçilmək hüququ verilmişdi. Eyni zamanda bütün xalqlar və bütün siyasi partiyalar Cümhuriyyətin parlamentində təmsil olunmuşdular. Azərbaycan Xalq Cümhuriyyətinin milli dövlətçiliyimiz tarixində, ictimai-siyasi fikir tariximizdə xüsusi şərəfli yeri və böyük rolu var. Dünya şöhrətli ictimai-siyasi xadim, müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ulu öndər Heydər Əliyev demişdir: "Azərbaycan Xalq Cümhuriyyəti az yaşasa da, xalqımızın azadlıq, müstəqillik fikirlərini daha da gücləndirmiş oldu".

Xalqımız Cümhuriyyət liderlərinin xatirəsini əziz tutur. Onların dövlət səviyyəsində yubileyləri keçirilir, eyni zamanda Azərbaycan Xalq Cümhuriyyətinin tarixi alimlərimiz tərəfindən araşdırılır, tədqiq edilir, layiq olduğu qiyməti alır və gənc nəslə öyrədilir.

Azərbaycanın dövlət müstəqilliyi xalqımızın ən böyük tarixi nailiyyəti, ən əziz, ən qiymətli sərvətidir. Bugünkü müstəqil Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətinin varisidir.

Sonda məruzəçi tələbələri maraqlandıran sualları cavablandırıb.



# "Gənclərimiz dövlətin etimadını hər addımda doğruldurlar"

*Müsahibimiz Bakı Dövlət Universitetinin doktorantı, ADPU-nun rektor köməkçisi Riyad Rüstəmlidir. Riyad Rüstəmli Bakı Dövlət Universitetinin Politologiya və sosiaologiya kafedrasının doktorantıdır. Onun məqalələri respublikamızın və digər ölkələrin nüfuzlu elmi məcmuələrində işıq üzü görür. Bundan əlavə o, mütəmadi olaraq ümumrespublika və beynəlxalq konfranslarda elmi məruzələrlə çıxış edir.*



Riyad Rüstəmli hələ universitet illərində Sosial Elmlər və Psixologiya fakültəsinin Gənclər Təşkilatının sədri olub. 2009-2013-cu illərdə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) layihələr Koordinatoru, is icraçısı kimi könüllü fəaliyyət göstərib. 2012-2013-cü ilin tədris ilində BDU-da "İlin ən yaxşı tələbəsi" müsabiqəsinin qalibi olub.

2010-2013-cü ildə SIFE (Students In Free Enterprisers ) komandasının rəhbəri kimi "Ali məktəblər arası ən yaxşı sosial layihə" nominasiyasının qalibi olaraq, ona göstərilən etimadı doğrultmuşdur. 2011-ci ildə MDB Gənc Liderləri üçün təşkil olunmuş düşərgənin qalib komandasının rəhbəri olaraq vətəninə növbəti uğuru qazandırıb. Düşərgənin "Ən yaxşı kapitan"ı nominasiyanin qalibi seçilib.

2016-cı ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinə rektor köməkçisi vəzifəsinə təyin edilmişdir. Yeni Azərbaycan Partiyasının gənc üzvlərindəndir.2 fevral 2018-ci il tarixində Gənclər Günü münasibətilə Yeni Azərbaycan Partiyasının Sədr müavini və İcra katibi Əli Əhmədov tərəfindən fəxri fərmanla təltif edilib.

**- Riyad müəllim, Azərbaycanda həyata keçirilən dövlət gənclər siyasəti haqqında fikirlənizi bilmək maraqlı olardı.**

- Ölkəmizdə həyata keçirilən siyasətin başlıca istiqamətlərindən biri də gənclərə dövlət dəstəyinin gücləndirilməsi, onlara hərtərəfli diqqət göstərilməsidir.Hər bir dövlətin əsas missiyası gələcəyini etibar edəcəyi nəsil hazırlamaqdır. Bu gün Azərbaycanda gənclər siyasəti dövlət siyasətinin mühüm tərkib hissəsidir. Azərbaycan gəncliyi ictimai həyatın bütün sferalarında aktiv fəaliyyəti ilə seçilir və siyasi, iqtisadi, humanitar, sosial tədbirlərin həyata keçirilməsində mühüm rol oynayır. Dövlətin gənclərin fəaliyyəti üçün yaratdığı geniş imkanlar nəticəsində bu təbəqə cəmiyyətin əsas qüvvəsinə çevrilib. Son illərdə respublikamızın əksər regionlarında müasir standartlara cavab verən Gənclər mərkəzləri, Uşaq yaradıcılıq mərkəzləri istifadəyə verilib, orta və ali təhsil ocaqları müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin olunub. Bu gün ölkədə gənc nəslə diqqət və qayğı dövlətin ən mühüm fəaliyyət istiqamətlərindən birinə çevrilib. Azərbaycan gənclərinin təşkilatlanması əsas məqsədlərdən biri kimi qarşıya qoyulub. Uğurla həyata keçirilən dövlət gənclər siyasəti bu gün gənclərin ölkə həyatının bütün sahələrindəki fəallığını daha da artırıb. Azərbaycanda gənclərin inkişafı üçün dövlət səviyyəsində kifayət qədər işlər görülüb, uşaq və gənclərin qeyri-hökumət təşkilatlarının yaradılması, fəaliyyətlərinin təşkili üçün şərait yaradılıb.

Azərbaycan gənclərinin müasir, inkişaf etmiş, yüksək intellektli aparıcı qüvvə kimi formalaşmasında, birmənalı olaraq, dövlətimizin apardığı gənclər siyasətinin mühüm rolu var. Bu siyasətin banisi isə xalqımızın ümummilli lideri Heydər Əliyevdir. O, həmişə gənclərimizə böyük ümidlər bəsləyib, onları "Azərbaycanın gələcəyi" adlandırıb və dəfələrlə qeyd edib ki, Azərbaycanın gələcəyi etibarlı əllərdədir. 1997-ci ildən etibarən hər il fevral ayının 2-si respublikamızda Gənclər Günü kimi qeyd edilir. Bu bayram Azərbaycan gənclərinə ümummilli lider Heydər Əliyevin bir hədiyyəsi və gəncliyə göstərilən diqqət və qayğının nümunəsidir. Gənclər Günü MDB məkanı və Şərqi Avropa ölkələri arasında ilk dəfə Azərbaycanda keçirilib. Dünya üzrə isə 1998-ci ildən etibarən Birləşmiş Millətlər Təşkilatının qərarı ilə avqust ayının 12-də Ümumdünya Gənclər Günü kimi qeyd edilir. Azərbaycanda dövlət gənslər siyasətinə aid bir sıra dövlət proqramları, Azəbaycan Respublikasının qanunları tətbiq edilib və ölkədə yaradıcı, istedadlı gənclərə dövlət qayğısı gündən-günə artır.

Ulu öndər Heydər Əliyevin müəyyənləşdirdiyi gənclər siyasəti bu gün Azərbaycan Prezidenti İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Prezidentin 2005-ci ildə imzaladığı "Azərbaycan Gəncliyi Dövlət Proqramı" (2005-2009-cu illər) məqsədinə uyğun olaraq icra olunmuş və qarşıya qoyulan vəzifələr yüksək səviyyədə həyata keçirilmişdir. Bundan əlavə 2011-ci il dekabrın 19-da Prezident İlham Əliyevin sərəncamı ilə "Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondu" yaradılmışdır.

Prezident İlham Əliyevin "Azərbaycan gəncliyi 2017-2021-ci illərdə" Dövlət Proqramının təsdiq etmişdir. Dövlət Proqramının məqsədi Azərbaycanda gənclər siyasətinin daha səmərəli həyata keçirilməsinə nail olmaq, cəmiyyətin bütün sahələrində gənclərin fəal iştirakına şərait yaratmaq, onların yaradıcı və innovativ potensialının üzə çıxarılmasını dəstəkləmək, gənc nəslin sağlamlığını qorumaq, gənclərin təhsil və məşğulluq məsələlərinə diqqəti artırmaq, müasir informasiya-kommunikasiya texnologiyalarından səmərəli istifadə etmək, ölkədə könüllülük hərəkatını inkişaf etdirməkdir.

Azərbaycan Respublikasının Birinci vitseprezidenti Mehriban xanım Əliyeva da öz diqqət və qayğısını gənclərdən əsirgəmir. Belə ki, onun sədrliyi ilə Bakıda "Gənclərin məşğulluq sammiti" uğurla həyata keçirilmişdir.

**-Ümumilikdə Azərbaycan gənclərinin ölkənin ictimai-siyasi həyatında iştirak səviyyəsini necə qiymətləndirmək olar?**

-Bu gün gənclər ölkənin ictimi-siyasi həyatında aktivdirlər. Gənclər siyasi proseslərdə fəal şəkildə iştirak edirlər. Bundan başqa fəal gənclərin, eləcə də gənclər təşkilatlarının layihələri həm Gənclər və İdman Nazirliyi, həm də Prezident yanında Gənclər Fondu tərəfindən maliyyələşdirilir. Bununla da gənclərin ictimai-siyasi aktivliyi bir qədər də artır. Yeni Azərbaycan Partiyasının Gənclər Birliyinin sıralarında 200 minə yaxın gəncin olması, həmin gənclərdən böyük əksəriyyətinin daha aktiv fəaliyyət göstərməsini deyilənlərə misal göstərmək olar. Bu gün öndə olan fəal gənclərin məhz Yeni Azərbaycan Partiyasının Gənclər Birliyində təmsil olunması da bizi sevindirir.

Xüsusi olaraq onu da qeyd edim ki, Leyla xanım Əliyevanın rəhbərlik etdiyi Rusiya Azərbaycanlı Gənclər Təşkilatı (AMOR) Rusiya Federasiyasında yaşayan və təhsil alan azərbaycanlı gənclərin bir araya gətirilərək diaspor və lobbiçilik işinə cəlb olunmasında, onların fəaliyyətlərinin əlaqələndirilməsində, gənclərlə bağlı müxtəlif tədbirlərin keçirilməsində, onları maraqlandıran mövzularda müzakirələrin aparılmasında xüsusi rol oynayır. Gənclər və İdman Nazirliyi gənclərimizin intellektual, mədəni inkişafı üçün nəzərdə tutulan layihələrin dəstəklənməsində, davamlı olmasında maraqlıdır. İstedadlı gənclərlə iş sahəsində normativ-hüquqi bazanın təkmilləşdirilməsi üçün mühüm işlər görülmüşdür.

**-Bir intellektual və fəal gənc olaraq həmyaşıdlarınıza nə məsləhət görürsünüz?**

-Hazırda dövlət gənclər siyasətinin apardığı uğurlu işlər nəticəsində aktiv gənclərin mədəniyyət, incəsənət, idman, elm, təhsil, texnologiya və başqa sahələrdə öz istedadlarını və qazandıqları uğurları layiqincə nümayiş etdirə bilir. Əgər əvvəllər istedadlı Azərbaycan gənci öz potensialını üzə çıxarmaq üçün şəraitin olmamasından haqlı olaraq gileylənirdisə, indi vəziyyət tam başqadır. Hər bir perspektivli Azərbaycan gəncinin yetişməsi üçün ölkəmizdə dövlət tərəfindən lazımi şərait yaradılıb. Həqiqətən də bu gün Azərbaycanda gənclər siyasətinin qarşısında duran əsas məqsədlər, əsasən, bu sahənin intellektual səviyyəsinin artırılması, gənclərimizin və yeniyetmələrimizin elmə, təhsilə yiyələnmələrinə nail olunması, iqtisadi amillər - yəni maliyyə durumlarının, sosial rifah göstəricilərinin yüksək olması, onların arasında azərbaycançılıq ideologiyasının, milli-mənəvi dəyərlərin mənimsənilməsi, gənclərimizin dövlət və hökumət strukturlarında geniş təmsil olunması və s. prioritet məsələlərdir.

Sonda onu da qeyd etmək istərdim ki, Azərbaycan dövləti ölkə gənclərinin bütün problemlərini həll edib, onlara hərtərəfli qayğı və diqqət göstərdiyi kimi, gənclərimiz də dövlətin etimadını hər addımda doğruldur, bütün sahələrdə xalqımıza üz ağlığı gətirirlər. Biz hər gün, hər addımda şahidi oluruq ki, Azərbaycan gəncliyi öz dövləti və lideri ətrafında sıx birləşmişib.

**Məlahət Babayeva**

# Tarix və cografiya fakültəsində akademik Qərib Məmmədovla görüş

Aprelin 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və cografiya fakültəsinin və Azərbaycan Cografiya Cəmiyyətinin (ACC) ADPU Filialının təşkilatçılığı ilə Cografiya-biologiya fakültəsinin məzunu, akademik Qərib Məmmədovla fakültə tələbələrinin görüşü keçirilib. Görüşdə fakültənin dekanı, dosent Şahin Pənahov, dekan müavini, dosent Mətanət Əsgərova, Ümumi cografiya kafedrasının müdiri, professor Məhəmməd Abduyev və kafedranın əməkdaşları, Ümumi tarix kafedrasının müdiri, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, professor Vəli Əliyev, Lehigh Universitetinin professoru, təhsil üzrə ekspert xanım Jill Sperandion və başqaları iştirak ediblər.



Görüşü giriş sözü ilə açan dosent Mətanət Əsgərova sözü tələbələrə verib. Fakültənin ACC üzvü olan tələbələri akademik Qərib Məmmədovun zəngin elmi-pedaqoji fəaliyyəti haqqında təqdimatla çıxış ediblər. Əvvəlcə fakültənin 202-ci qrup tələbəsi, ACC-nin ADPU Filialının tələbələr üzrə rəhbəri Aysun Hacıbəyli çıxış edərək akademikin həyatı, təhsili, pedaqoji fəaliyyəti haqda geniş məlumat verib.

201-ci qrup tələbəsi, ACC-nin əlaqələndiricisi Taleh Mirzəyev akademikin geodeziya-kartoqrafiya sahəsindəki əsərləri, dərslikləri, Q.Məmmədovun rəhbərliyi və ya yaxın iştirakı ilə tərtib olumuş xəritə və atlaslar (Torpaq Atlası, Ekoloji Atlas, Azərbaycan torpaqlarının ekoloji qiymət xəritəsi, Azərbaycanın Torpaq Xəritəsi, Naxçıvanın Torpaq Xəritəsi, Naxçıvan torpaqlarının ekoloji qiymət xəritəsi və s.) və bu əsərlər arasında yüksək səviyyəyə malik olan "Azərbaycan Respublikasının Milli Atlası" və "Cənubi Qafqaz - 1903-cü il" xəritəsi haqqında ətralı məlumat verib, bu əsərlərin dövlət və ümummilli strateji əhəmiyyətini xüsusi vurğulayıb.

301-ci qrup tələbəsi Sürəyya Cəfərova akademikin ekologiya, torpaqşünaslıq və ekologiya sahəsindəki elmi-tədqiqatları, aldığı nəticələr, bu sahədəki dərslik və elmi əsərləri haqqında danışıb. Akademikin "Aqroekologiya", "Sosial ekologiya", "İnsan ekologiyası", "Meşə ekologiyası" əsərlərinin mahiyyəti barədə tələbələrə ətraflı məlumat verib.

202-ci qrup tələbəsi Aqşin Abbaszadə akademikin ümumən müxtəlif sahələrdə yazdığı fundamental elmi əsərləri haqqında təhlili məlumatlar verib.

302-ci qrup tələbəsi Təhminə Abbaszadə akademik Q.Məmmədovun bütün bu gərgin və məhsuldar elmi araşdırmalarının nəticəsi olaraq onun müxtəlif dövrlərdə yerli və beynəlxalq səviyyədə təltif olunduğu mükafatlardan bəhs edib, akademikin 2017-ci il yanvarın 9-da Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə "Şöhrət" ordeni ilə təltif edilməsini xüsusi vurğulayıb.

302-ci qrup tələbəsi Həyat Nəsirova ümumi olaraq akademikin həyatı, elmi fəaliyyəti, təltif olunduğu mükafatlar haqqında ingilis dilində təqdimatla çıxış edib.

Akademik Q.Məmmədov çıxış edərək tələbəlik illərinin keçdiyi doğma fakültəsində olmaqdan məmnun qaldığını bildirib, həmçinin görüşdə iştirak edən tələbələrin fəallığının onda xoş hisslər yaratdığını ifadə edib, tələbələrlə öz dəyərli fikirlərini bölüşüb. Sonra akademik tələbələr üçün "Milli atlas və geoməkan məlumatlarından istifadə edilməsi" adlı maraqlı elmi təqdimat edib, kartoqrafiya, coğrafiya, torpaqşünaslıq kimi elmlərin müasir informasiya əsaslı inkişaf meyilləri, həmçinin elektron hökumət modelindən geohökumət modelinə keçidin konsepsiyası barədə ətraflı məlumat verib.

Professor V.Əliyev və Q.Məmmədovla tələbə yoldaşı olmuş dosent Dadaş Ələsgərov akademik haqda öz fikirlərini bölüşüblər.

Sonda xatirə şəkli çəkdirilib.

# ADPU-nun nəzdində ADPK-də Əməkdar incəsənət xadimi İslam Səfərlinin 95 illik yubileyinə həsr olunmuş tədbir

Aprelin 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) "Azərbaycan dili və ailə üzvləri, yaxın dostları iştirak ediblər.

Kollecin tələbələrinin ifasında şairin şeirləri, sözlərinə yazılmış mahnılar səsləndirilib. İslam Səfərlinin "Göz həkimi"



ədəbiyyatı" fənn birləşməsinin müəllimi, filologiya üzrə fəlsəfə doktoru Vəfa Yunusova tərəfindən hazırlanmış Əməkdar incəsənət xadimi, nəğməkar şair, dramaturq İslam Səfərlinin 95 illik yubileyinə həsr olunmuş "Gəl sevək bu həyatı" adlı tədbir-konsert keçirilib. Tədbirdə şairin tamaşasından bir fraqment nümayiş olunub. İslam Səfərlinin oğlu İlham Səfərli ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzova təşəkkür edərək ailə üzvləri adından nəfis şəkildə hazırlanmış təşəkkürnaməni təqdim edib.

Sonda xatirə şəkli çəkdirilib.

# “İrəvanda milli maarifçilik mühiti” kitabı haqqında düşüncələrim

ADPU-nun professoru Cəfər Cəfərovun və dosent Cəlal Allahverdiyevin böyük tarixi əhəmiyyəti olan ”İrəvanda milli maarifçilik mühiti” adlı kitabı nəşr edilmişdir. Bu dəyərli kitabın elmi redaktorları filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilov, tarix üzrə fəlsəfə doktoru, Dövlət mükafatı laureatı Nazim Mustafa, rəyçilər pedaqogika üzrə elmlər doktoru, professor Əjdər Ağayev, pedaqogika üzrə elmlər doktoru, professor Rüfət Hüseynzadə, filologiya üzrə elmlər doktoru, professor Mahirə Nağıqızı, pedaqogika üzrə elmlər doktoru Həsən Bayramoğludur.

ADPU-da bu əsərin geniş təqdimat mərasimi keçirildi. ADPU-nun rektoru, professor Cəfər Cəfərov elmi-tarixi faktlara əsaslanan bu kitabın maarifpərvər ziyalılarımızın həyat və fəaliyyətinin öyrənilməsi, tədqiq edilməsi üçün əhəmiyyətli mənbə olduğunu dedi. Rektor İrəvan maarifçilik mühitinin təmsilçilərinin xalqımızın mənəvi təkamülündə, ölkəmizin mədəni inkişafında sanballı xidmətlər göstərdiyini diqqətə çatdırdı. Kitabın əhəmiyyəti haqqında dəyərli fikirlər söyləyən rektor, onun geniş oxucu kütləsi arasında yayılmasını tövsiyə etdi.

Təqdimat mərasimini yüksək səviyyədə aparan Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov bildirdi ki, “İrəvanda milli maarifçilik mühiti” kitabı təhsil tariximizin ardıcıl tədqiqi baxımından böyük önəm daşıyır və təhsilimiz üçün layiqli töhfədir. İrəvan təhsil mühiti Azərbaycan təhsilinin bir parçasıdır. Bu baxımdan,“İrəvanda milli maarifçilik mühiti” kitabı yeni axtarışlara, araşdırmalara, elmi-tədqiqatlara istiqamət verir. İrəvan təhsil mühitinin yetirmələrinin bir çoxu ADPU-da çalışaraq universitetimizin inkişafında mühüm rol oynamışlar.

Təqdimat mərasimində professor Rüfət Hüseynzadə, Bakı Dövlət Universitetinin professoru Əyyub Əzizov, professor Cəlil Nağıyev, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, professor Vəli Əliyev və başqaları hərtərəfli elmi araşdırmalar, böyük əmək, fədakarlıq, milli təəssübkeşlik, vətənpərvərlik sayəsində ərsəyə gələn “İrəvanda milli maarifçilik mühiti” kitabını yüksək dəyərləndirib, müəlliflərə uğurlar arzuladılar.

Dəyərli fakt və məlumatlar, tarixi mənbələr, arxiv sənədləri, fotosənədlər əsasında böyük zəhmət hesabına başa çatdırılmış bu qiymətli əsər - “İrəvanda milli maarifçilik mühiti” kitabının milli təhsilimizin, maarif və mədəniyyətimizin inkişafında xüsusi yeri və əhəmiyyəti vardır. İrəvan maarifçilik mühitinin öyrənilməsi pedaqoji fikir tariximizi, təhsil tariximizi yeni bilik və məlumatlarla xeyli zənginləşdirir və dəyərli ensiklopedik mənbəyə çevrilir.

Ümummilli liderimiz Heydər Əliyev haqlı olaraq deyirdi ki, gənc nəslimiz öz milli-mənəvi dəyərlərini öyrəndikcə, öz keçmişindən qürur duyur və onlarda öz soyuna, kökünə, millətinə bağlılıq daha da möhkəmlənir.

Bu gün İrəvan maarifçilik mühiti ilə tanış olan müasir oxucu, xüsusilə gənclərimiz bizim qədim, ulu torpaqlarımızın Qərbi Azərbaycan dediyimiz məkanda, əzəli Azərbaycan torpaqlarında xalqımızın necə zəngin maarif və mədəniyyətə sahib olduğunun, necə dəyərli məktəblər, texnikumlar, ali məktəblər yaratdıqlarının, bu təhsil müəssisələrində necə fədakar, səriştəli, peşəkar pedaqoji kadrların, elm xadimlərinin yetişməsini öyrəndikcə milli iftixar hissi keçirir və qürur duyurlar.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev Yeni Azərbaycan Partiyasının (YAP) VI qurultayndakı nitqində demişdir: ”Onu da qeyd etməliyəm ki, biz tarixi torpaqlarımızı da unutmamalıyıq və unutmuruq. Bu da gələcək fəaliyyətimiz üçün istiqamət olmalıdır, necə ki, biz bu gün də bu istiqamətdə iş görürük. Bizim tarixi torpaqlarımız İrəvan xanlığıdır, Zəngəzur, Göyçə mahallarıdır. Bunu gənc nəsil də, dünya da bilməlidir. Mən şadam ki, bu məsələ ilə bağlı - bizim əzəli torpaqlarımızın tarixi ilə bağlı indi sanballı elmi əsərlər yaradılır, filmlər çəkilir, sərgilər təşkil olunur. Biz növbəti illərdə bu istiqamətdə daha fəal olmalıyıq və dünyanın müxtəlif yerlərində sərgilər, təqdimatlar keçirilməlidir. Çünki İrəvan bizim tarixi torpağımızdır və biz azərbaycanlılar bu tarixi torpaqlara qayıtmalıyıq. Bu, bizim siyasi və strateji hədəfimizdir və biz tədricən bu hədəfə yaxınlaşmalıyıq”.

Hələ XIX əsrin sonlarında pedaqoji kadr hazırlığında Qori Müəllimlər Seminariyasının və İrəvan Müəllimlər Seminariyasının azərbaycanlı məzunların yetişdirilməsində böyük rolu olmuşdur. 1879-cu ildə Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsi yaradıldı ki, burada 40 il müddətində 300-ə qədər azərbaycanlı məzun təhsil almışdır. Onların arasında Nəriman Nərimanov, Firudin bəy Köçərli, Rəşid bəy Əfəndiyev, Cəlil Məmmədquluzadə, Üzeyir Hacıbəyli, Süleyman Sani Axundov, Səfərəli bəy Vəlibəyov, Məmmədəli Sidqi Səfərov, Əli Səbri Qasımov, Fərhad Ağazadə və başqaları olmuşdur.

XIX əsrin 80-ci illərinin əvvəllərində İrəvanda kadr hazırlayan üç böyük tədris müəssisəsi yaranıb fəaliyyət göstərmişdir. Onlardan biri 1881-ci ildə açılmış İrəvan Kişi Gimnaziyası, ikincisi yenə həmin ildə yaranmış İrəvan Müəllimlər Seminariyası və üçüncüsü 1884-cü ildə yaranmış İrəvan Qız Progimnaziyasıdır. 1881-ci ildə fəaliyyətə başlayan İrəvan Müəllimlər Seminariyası 37 il fəaliyyət göstərib. Bu təhsil müəssisəsi 1918-ci il avqustun 6-da İrəvan gimnaziyası və Uluxanlı məktəbi ilə eyni vaxtda bağlanmışdır.

Qori Müəllimlər Seminariyasını bitirən məzunların bir çoxu İrəvan Müəllimlər Seminariyasında da dərs demişlər ki, onlardan Firudin bəy Köçərlini, Cəlil Məmmədquluzadəni, İsmayıl bəy Şəfibəyovu və başqalarını göstərə bilərik. Ümumiyyətlə, İrəvan Müəllimlər Seminariyasının müəllimlərindən aşağıdakıların adlarını çəkə bilərik: Məmmədbarır Qazızadə, Mixail Klopov, Axund Məmmədbarır Kazımzadə, Firidun bəy Köçərli, Mirzə Məmmədvəli Qəmərli, Rəhim Xəlilov, Məmməd Axundov, K.Şulgin, Mirzə Abbas Məhəmmədzadə, İsmayıl bəy Şəfibəyov, Cabbar Məmmədzadə.

İrəvan Müəllimlər Seminariyasının məzunlarından isə aşağıdakıların adlarını çəkə bilərik: Həbib bəy Səlimov, Nəcəf bəy Vəzirov, Haşım bəy Vəzirov, Mirzə Abbas Məhəmmədzadə, Cabbar Məhəmmədzadə, Vahid Musabəyov, Həmid bəy Şahtaxtinski, Hüseynəli bəy Rüstəmbəyov, İbadulla bəy Muranlinski, Tağı bəy Səfiyev, Mirzə Cəlil Şürbi, Eynəli bəy Sultanov, Sadıq Xəlilov, Vahid Musabəyov.




XIX əsrin əvvəllərindən başlayaraq 1920-ci ilə qədər İrəvan sürətlə inkişaf etmiş və bu bölgə böyük mədəniyyət mərkəzlərindən biri olmuşdur. İrəvan şəhəri Bakı, Təbriz, Naxçıvan, Xoy və başqa şəhərlər kimi Azərbaycanın aparıcı elm və mədəniyyət mərkəzi olmuşdur. Buna görə də Şərq elmi tarixində xeyli “İrəvani” təxəllüslü məşhur şəxslərə rast gəlmək olur. Məsələn, Mirzə Qədim İrəvani (1825-1875) məşhur rəssam və nəqqaş olmuşdur. Hacı Süleyman ibn Salman Qacar İrəvani XVIII əsrdə yaşamış görkəmli Azərbaycan həkimi və alimi olmuşdur. Şeyxülislam Fazil İrəvani XIX əsrdə Qafqazın Şeyxülislamı olmuşdur.

Bu dəyərli əsərdən məlum olur ki, 1924-cü il oktyabrın 15-də İrəvan Türk Pedaqoji Texnikumu adi ilə fəaliyyətə başlayan texnikum 1949-cu ilə qədər fəaliyyət göstərmişdir. Qeyd edim ki, “İstiqlal” ordenli, Əməkdar müəllim, dosent atam Lətif Hüseynzadə Azərbaycan Dövlət Universitetinin 1930-cu il məzunu kimi bir müəllim olaraq təyinatla İrəvan Pedaqoji Məktəbində və daha sonralar isə İrəvan Pedaqoji İnstitunun Azərbaycan şöbəsində dərs demiş, pedaqoji kadrların hazırlığında dəyərli xidmətlər göstərmiş, İrəvan yazıçı və şairlərinin ədəbi orqanı olan ”Ədəbi Ermənistan” almanaxının redaktoru vəzifəsində çalışmışdır. İrəvan Pedaqoji Məktəbinin məzunları olmuş, sonralar yüksək elmi dərəcələrə nail olmuş, uzun illər elm və təhsil sahəsində çalışmış akademik Budaq Budaqov, akademik Zərifə Budaqova, professor Əli Fərəcov, professor Yusif Yusifov, professor Cəfər Cəfərov, professor Süleyman Məmmədov, professor Nəriman Əliyev, professor Fərhad Fərhadov, professor Qasım Mustafayev, professor Tapdıq Əmiraslanov, Əməkdar müəllim, filologiya üzrə fəlsəfə doktoru, dosent Nəcəf Nəcəfov, dosent Zəhra Əliyeva, ADPU-nun professoru olmuş Kövsər Tarıverdieva xalqımızın fədakar, peşəkar müəllimləri, elm adamları, ictimai xadimləri kimi xalqa, Vətənə ləyaqətlə xidmət etmişlər. Azərbaycanın bir çox görkəmli ziyalıları - Cəlil Məmmədquluzadə, Əli Nazim, Mir Cəlal Paşayev, Səməd Vurğun, Mikayıl Rəfili və başqaları bu pedaqoji məktəbdə olmuş, tələbələrlə görüşmüşlər.

Kitabdan məlum olur ki, 1936-cı ildə İrəvan Dövlət Qiyabi Pedaqoji İnstitutu, 1937-ci ildə ikiillik Müəllimlər İnstitutu, daha sonra isə 1945-1988-ci illərdə İrəvan Pedaqoji İnstitutunun Azərbaycan şöbəsi fəaliyyət göstərmişdir. Bu qiymətli əsərdə burada dərs deyən müəllimlər, həmçinin tələbələr, məzunlar haqqında dəyərli məlumatlar verilmişdir.

Kitabın müəllifləri Cəfər müəllim və Cəlal müəllim çox gərgin əmək, zəhmət sərf etmiş, diqqətlə araşdırmalar aparmış və çalışmışlar ki, heç kim, heç nə yaddan çıxmasın. Mən bu kitabda öz adıma rast gələndə sevindim. Mən də İrəvan Pedaqoji İnstitutunda təhsil almışam. Kitabda bu institutun məşhur məzunlarının adları çəkilir: Akademik Zərifə Budaqova, professor Mirəli Seyidov, professor İbrahim Bayramov, professor Hüseyn Əmirov, Zəhra Əliyeva, Aidə Salahova və başqaları.

Bu institutda dərs demiş Əkbər Yerevanlı, Lətif Hüseynzadə, Adil Süleymanov, Sabir Əsədov, İsrafil Məmmədov, Fərrux Rzayev, Hüseyn İsmayılov, Məhərrəm Hüseynov kimi tanınmış pedaqoq-alimlər haqqında da maraqlı, elmi-pedaqoji əhəmiyyətli məlumatlar verilmişdir.

Bu dəyərli kitabda İrəvan elmi, mədəni və pedaqoji mühitinin formalaşmasında, inkişafında Azərbaycanın görkəmli şəxsiyyətlərinin, o cümlədən Məmməd Səid Ordubadinin, Mikayıl Müşfiqin, Mehdi Hüseynin, Cəlil Məmmədquluzadənin, Mir Cəlal Paşayevin, Əziz Əliyevin, Səməd Vurğunun, Yusif Vəzir Çəmənzəminlinin, Əziz Şərifin, Hacı Kərim Sanılının və başqalarının xidmətləri ətraflı şərh olunur.

Kitabda İrəvan pedaqoji mühitinin yetişdirmələri olmuş, ”Əməkdar müəllim” və digər fəxri adlara layiq görülmüş müəllim, ziyalıların, həmçinin 1930-cu illərdə repressiyaya məruz qalmış azərbaycanlı ziyalıların siyahısı verilmişdir ki, bu da kitabın məlumatlılıq baxımından əhəmiyyətini xeyli artırmış və bir növ ensiklopedik xarakter daşımasına səbəb olmuşdur.

İrəvan Pedaqoji İnstitutunda dərs demək üçün müxtəlif illərdə Bakıdan da müəllimlər dəvət olunmuşdur: Professor İnayət Bektaşi, professor Firudin Hüseynov, professor Əkbər Bayramov, professor Əhməd Seyidov, professor Hüseyn Əhmədov, professor Xalid Əlmirzəyev, professor Cəfər Cəfərov, professor Abbas Zamanov, professor Mürsəl Həkmov, professor Nizami Xudiyev, professor Cəlil Nağıyev, professor Bəxtiyar Vahabzadə və başqaları.

Bu əsərdə verilən maraqlı xatirələr xüsusi yaradıcılıq məharəti ilə işlənmişdir ki, onların da tarixi əhəmiyyəti yüksəkdir. Burada professor Cəfər Cəfərovun İrəvan Pedaqoji Məktəbində oxuyarkən tələbəlik illəri ilə bağlı xatirələri, o cümlədən tanınmış elm xadimləri professor Həsən Mirzəyev, professor Mirabbas Heydərov, professor Qasım Müstafayev və professor Budaq Budaqovla bağlı xatirələri elmi ictimaiyyətimiz üçün böyük maraq kəsb edir.

Həmçinin kitabda İrəvan pedaqoji mühitinin yetişdirdiyi görkəmli elm xadimlərinin, tanınmış ziyalı alimlərimizin adları çəkilir ki, onların sırasında ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, tanınmış ictimai xadim Mehdi bəy İsmayılov, tanınmış aktyor Rza Şeyxzadə, milli maarif və mədəniyyətimzin inkişafında böyük xidmətləri olmuş Əkbər Rzayevin və onun oğlu, sənətşünaslıq doktoru Sabir Rzayevin və başqalarının adları böyük hörmətlə çəkilir, onlar haqqında dəyərli tarixi məlumatlar verilərək ictimaiyyətə çatdırılır.

Bu kitabın dəyərli cəhətlərindən biri də müxtəlif illər üzrə müəllim və tələbə kollektivinin, dərs deyən pedaqoji ictimayyətin nümayəndələrinin, İrəvan pedaqoji mühiti ilə bağlı olan şəxslərin fotoşəkillərinin yer almasıdır.

”İrəvanda milli maarifçilik mühiti” kitabı təhsil tariximiz, pedaqoji fikir tariximiz, maarif və mədəniyyətimizin inkişaf tarixi üçün dəyərli, ensiklopedik əsərdir. Bu əsərin tələbə auditoriyalarında, pedaqoji tədqiqat sahələrində, maarif və mədəniyyət tariximizin tədqiqində davamlı öyrənilməsini xeyli faydalı və əhəmiyyətli hesab edirəm.

**Rüfət Hüseynzadə,**
**pedaqogika üzrə elmlər doktoru,**
**professor, Əməkdar müəllim**

# İbtidai təhsil fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası



Aprelin 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilb. İclasda fakültənin 45 nəfər əməkdaşından 35 nəfəri iştirak edib.

Fakültənin dekanı, Elmi Şuranın sədri, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov fakültə Elmi Şurasının yeni tərkibinin seçilməsini zəruri edən səbəblərdən danışıb. Qeyd edib ki, fakültə Elmi Şurasının 2 nəfər üzvünün universitetdən ayrılması, professor Seyidağa Həmidovun vəfatı ilə əlaqədar olaraq tərkib yenilənməlidir.



Elmi Şuraya üzv seçiləcək əməkdaşların namizədliyi ilə bağlı müzakirələr aparılıb. 15 nəfər (8 nəfər tutduğu vəzifəyə görə) gizli səsvermə yolu ilə fakültə Elmi Şurasına üzv seçiliblər.

# SABAH qruplarının Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi münasibətilə bilik yarışının ikinci mərhələsi və final mərhələsi



Məlumat üçün bildirək ki, Azərbaycan Respublikası Təhsil Nazirliyinin SABAH qruplarının Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi münasibətilə riyaziyyat, müəllimlik və informasiya texnologiyaları üzrə bilik yarışının birinci mərhələsi bu ilin mart-aprel aylarında keçirilib. Qeyd edək ki, 8 ali təhsil müəssisəsini əhatə edən bu yarışda ümumilikdə SABAH qruplarının 500-dən çox tələbəsi iştirak edib. Yarışlar Bakı Dövlət Universitetində (BDU), Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) və Azərbaycan Texniki Universitetində (ATU) keçirilib. Yarışın birinci mərhələsinin nəticələrinə əsasən, 300-dən çox tələbə ikinci mərhələdə iştirak etmək hüququ qazanıb. Aprelin 18-də isə ADPU-da müəllimlik üzrə bilik yarışının ikinci mərhələsi və final mərhələsi keçirilib. İkinci mərhələnin sonunda birinci mərhələni uğurla keçənlərə sertifikatlar verilib və final mərhələyə keçənlər müəyyən edilib. Yazılı şəkildə aparılan final mərhələsində qaliblər müəyyən edilib. I yeri BDU-nun tələbəsi Tamara Əliyeva, II yeri ADPU-nun tələbəsi Nərmin Mahmudova, III yeri Azərbaycan Dillər Universitetinin (ADU) tələbəsi Nərmin Səfərova tutub. Qaliblərə aprelin 25-də BDU-da keçirilmiş mükafatlandırma mərasimində hədiyyə və sertifikatlar təqdim edilib.

# Peşəsinə sadiq müəllim ömrü



**Bəşər tarixinin bütün dövrlərində ağıllı, zəkalı qadınlara ehtiyac olub. Çünki həyatımızın elə sahəsi yoxdur ki, orada qadınlar öz nurlu əməlləri ilə böyük tale və xoşbəxtlik bəxş etmək, həyatın ağrılarını zərif çiyinlərində daşımaq iqtidarında olmasınlar. Bu cür qadınlar analığa, siyasi və ictimai xadimliyə də layiqdirlər. Azərbaycan xalqı özünün istedadlı, elm və mədəniyyət sahəsində çalışan qadınları ilə qürur duyur.**

Musiqi pedaqogikası sahəsində görkəmli pedaqoq-alim, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) professoru, pedaqoji elmlər doktoru Minarə Rəhim qızı Dadaşova məhz belə qadınlarımızdandır.

Kökü ziyalı, alicənab bir nəslin yetirməsi olan Minarə Dadaşova 1948-ci il may ayının 4-də Bakı şəhərində anadan olmuşdur. Onun valideynləri - atası Rəhimağa Dadaşov, əsl ziyalı, yüksək əxlaqi keyfiyyətlərə malik inşaatçı - mühəndis, anası - tanınmış həkim, ömrünün 70 ilini Azərbaycan Dövlət Tibb Universitetində böyük bir həkim nəslinin yetişdirilməsinə həsr etmiş, professor Səyalı xanım Tağıyeva olmuşlar. Bu ailənin təməli xeyirxahlıq, nəciblik, vətənpərvərlik kimi xüsusiyyətlər üzərində qurulmuşdur. Milli dəyərləri övladlarına böyük məhəbbətlə təlqin etmiş ləyaqətli bir ananın, Səyalı xanımın tərbiyəsi ilə böyüyən Minarəyə anasının ömür yolu əsl həyat məktəbi olmuşdur. O da həyatı boyu öz təbiətində yüksək mənəvi keyfiyyətləri birləşdirərək dərin intellektə, geniş dünyagörüşünə sahib olmuşdur. Yüksək intellekt səviyəsi, insanlarla səmimi, xoş münasibəti onu hamıya sevdirmişdir.

1965-ci ildə 34 saylı orta məktəbi və Dövlət Təhlükəsizlik Komitəsinin nəzdində orta ixtisas musiqi məktəbini bitirdikdən sonra Minarə Dadaşova 1966-1971-ci illərdə Üzeyir Hacıbəyli adına Azərbaycan Dövlət Konservatoriyasında Əməkdar incəsənət xadimi, professor Fəridə Quliyevanın sinfində "Fortepiano" ixtisası üzrə ali təhsil almışdır. 1965-1982-ci illərdə özünün təhsil aldığı musiqi məktəbində müəllim kimi işləmiş və kollektivin nüfuzunu qazanmışdır. Lakin müəllimlik peşəsi ilə yanaşı, elmə böyük həvəsi onu ADPU-da keçirilən müsabiqədə iştirak etməyə sövq etdi.

1982-ci ildə M.Dadaşova universitetin Musiqi alətləri kafedrasına müəllim vəzifəsinə seçilir. Həmin il o, Moskvaya üçaylıq təkmilləşdirmə kurslarına göndərilir. Sonradan Ümumi pedaqogika kafedrasında "Pedaqogikanın tarixi və nəzəriyyəsi" ixtisası üzrə aspiranturaya qəbul olunur.

Minarə xanımın ADPU-nun Musiqi alətləri kafedrasınada keçən 36 illik fəaliyyəti mənim gözlərim önündə olmuşdur. O, bütün biliyini, bacarığını, duyğularını musiqi sənətinə, müəllim peşəsinə fədakarcasına həsr etmişdir. M.Dadaşova hər bir tələbənin qəlbinə yol tapmağı bacaran müəllimlərdəndir. Bu da ondan irəli gəlir ki, o, əsl müəllim kimi insan psixologiyasına gözəl bələddir. Təsadüfi deyil ki, onun 1989-cu ildə müdafiə etdiyi namizədlik dissertasiyası "Pedaqoji fakültə tələbələrində yaradıcı təxəyyülün tərbiyəsi" mövzusunda olmuşdur.

Musiqi alətləri kafedrasında 1982-ci ildən pedaqoji fəaliyyətə başlayan M.Dadaşova əvvəlcə kafedranın müəllimi, baş müəllimi (1989), dosenti (1994), 2001-ci idən 2017-ci ilə kimi bu kafedranın müdiri vəzifəsində çalışmışdır.

M.Dadaşova kafedraya rəhbərlik etdiyi dövrdə tədrislə bağlı məsələlərlə yanaşı, konfranslar, sinif konsertləri, yubiley gecələri, tanınmış musiqi xadimləri ilə görüşlərin keçirilməsinə də diqqət yetirirdi. Onun rəhbərliyi ilə kafedrada Üzeyir Hacıbəylinin 110, Bülbülün 110, Qara Qarayevin 85, Fikrət Əmirovun 80, Tofiq Quliyevin 90, Süleyman Ələsgərovun 85, Arif Məlikovun 70, Vaqif Mustafazadənin 65, Şövkət Ələkbərovanın 80 illik yubiley tədbirləri, Vasif Adıgözəlov, Sevda İbrahimova, İsmayıl Hacıbəyov, Ramiz Zöhrabov, Elnara Dadaşova və başqaları ilə yaradıcılıq görüşləri təşkil olunmuşdur.

Minarə xanım musiqi sahəsində daim araşdırmalar aparan tədqiqatçı alimdir. 60-a yaxın elmi məqalənin müəllifi olan professor M.Dadaşova, tədris -metodik göstərişlərin, fənn proqramlarının, dərslik və dərs vəsaitlərinin yaranmasına böyük əmək sərf etmişdir. Onların arasında "Psixologiya, pedaqogika və musiqidə yaradıcı təxəyyül məsələləri"(1995), "Tələbələrdə musiqi təfəkkürünün inkişafına kömək göstərən biliklər" (2002) "Ümumtəhsil məktəbinin gələcək musiqi müəlliminin bacarıq və vərdişləri" (2002) monoqrafiyaları, "Musiqi dərsləri prosesində təxəyyülün inkişafı" (1993), "Fortepiano tədrisinin metodikası" (2007), "Musiqi müəlliminin hazırlığında bilik, bacarıq və vərdişlər kompleksi" (2008), "Əsas musiqi aləti və onun tədrisi metodikası" (2017) dərslikləri, "Fortepianoda çalmaq üçün dərs vəsaiti" (Z.Abdullayeva ilə birgə, 1998, 2007), "Musiqi fənlərinin tədrisində fortepiano alətinin rolu" (2004), "Musiqi müəlliminin hazırlığının nəzəri və praktik problemləri" (2009), "Musiqi müəlliminin pedaqoji hazırlığında fərdi məşğələlər" (2016), "Yaradıcı təxəyyül pedaqoji fəaliyyətdə" (2016) adlı dərs vəsaitləri müəllim və tələbələrin müraciət etdiyi tədris materialıdır.

Görkəmli alimin musiqi pedaqogikasının aktual problemlərinin həlli yollarında uzun illər apardığı səmərəli işlər öz bəhrəsini vermiş və o, 2006-cı ildə "Fortepianoda tələbələrin bilik, bacarıq və vərdişlərinin formalaşması sistemi" mövzusunda doktorluq dissertasiyasını müdafiə edərək, pedaqoji elmlər doktoru elmi dərəcəsinə layiq görülmüşdür. 2010-cu ildə professor vəzifəsinə seçilmişdir.

Minarə xanımın elmi-pedaqoji fəaliyyəti təkcə çoxşaxəli elmi-tədqiqat işləri aparmaqla kifayətlənmir. O, öz sahəsini mükəmməl, dərindən bilən bacarıqlı, yüksək səviyyəli pedaqoji və elmi kadrların yetişməsinə də diqqət yetirmişdir. Onun rəhbərliyi altında yazılan namizədlik və magistr dissertasiyaları, diplom işləri M.Dadaşovanın 50 illik pedaqoji təcrübəsi ilə bir vəhdətdə, gənc musiqiçilərin hazırlığına müsbət təsirinin aydin təzahürüdür.

M.Dadaşova uzun illərdir ki, Pedaqoji Universitetin Elmi Şurasının və fakültə Elmi Şurasının, Bakı Musiqi Akademiyasının nəzdində yaradılmış Müdafiə Şurasının, ADPU-da fəaliyyət göstərən "Musiqi" ixtisası üzrə aparıcı təşkilat şurasının ən fəal üzvlərindəndir. Bu şuralarda dissertasiyaların müzakirələri zamanı o, irad və təkliflərini elə bir şəkildə ifadə edir ki, nə dissertant, nə də rəhbəri inciməsin, narahatlıq keçirməsin.

Ciddi alim, tələbkar pedaqoq M.Dadaşova həmkarları arasında böyük nüfuza malikdir. Onun müəllim və tələbələrlə rəftarında həmişə alicənablıq, yüksək mədəniyyət özünü büruzə verir. Bu da, görünür, tərbiyə aldığı ailədən, onu əhatə edən sağlam mühitdən irəli gəlir. Ona görə də həm universitetimizin rəhbərliyi, həmkarları və tələbələri M.Dadaşovaya həmişə dərin hörmət göstərirlər.

Minarə xanımın elmi-pedaqoji fəaliyyətindən danışarkən onun ictimai fəaliyyətini də qeyd etmək lazımdır. O, respublikada keçirilən bir çox müsabiqələrin münsiflər heyətinin üzvü, tez-tez televiziya verlişlərinin qonağı, simpozium və konfransların iştirakçısı olmuşdur. Çoxları onun musiqi pedaqogikasının müxtəlif məsələlərinə həsr olunmuş elmi məruzə, məqalə və resenziyalarla uğurlu çıxışlarının şahidi olmuşlar.

2006-cı və 2010-cu illərdə uzunmüddətli səmərəli elmi-pedaqoji fəaliyyətinə görə M.Dadaşova Təhsil Nazirliyi tərəfindən fəxri fərmanla təltif olunmuşdur. 2008-ci və 2010-cu illərdə yüksək səviyyəli elmi-tədqiqat işlərinə, tələbələrin elmi araşdırmalara həvəsləndirməsinə, elmi konfranslarda fəal iştirakına görə universitet daxilində keçirilən "İlin alimi" və "İlin müəllimi" müsabiqələrinin qalibi olmuşdur. M.Dadaşova elmi fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilib. O, 2012-ci ildə "Tərəqqi" medalı ilə təltif olunmuşdur.

M.Dadaşovanın 70 illik yaşının zirvəsindən geriyə baxanda onun həyat yolunun əsas sahələrindən olan elmi-pedaqoji fəaliyyətinin, elmi titullarının, mükafatlarının çoxluğunun şahidi olduq. Lakin bu adların arasında ən şərəflisi Ana adıdır. M.Dadaşova sədaqətli ömür yoldaşı, qayğıkeş anadır. Onun ən qiymətli əsəri iki övladı və dörd nəvəsidir. Böyüdüb boya-başa çatdırdığı övladlarına göstərdiyi analıq qayğısı, onların tərbiyəsi, ailələri ilə bağlı bütün məsələlərin həlli onun şərəfli vəzifələrindəndir.

Bu il ömrünün 70-ci baharını qeyd edən, M.Dadaşova yenə də gəncdir, gözəldir. Onun geyimi, davranışı, yerişi, danışığı Azərbaycan xanımına məxsus nəciblik, estetik gözəllik təcəssümüdür. Ömrünün 50 ilini müəllimlik peşəsinə həsr etmiş M.Dadaşova öz peşəsinə bütün qəlbi ilə bağlanıb, ona sədaqətlə xidmət etmişdir.

Əziz Minarə xanım! Sizi sevən və dərin hörmət bəsləyən həmkarlarınız əlamətdar yubileyiniz münasibətilə təbrik edir, cansağlığı, uzun ömür, yeni yaradıcılıq nailiyyətləri arzulayırlar.

**Zemfira Abdullayeva,**
**Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor**

# ADPU-nun Quba Filialında 2016-cı ilin Aprel hadisələri zamanı şəhid olmuş Vətən oğullarının xatirəsi yad edilib

Aprelin 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında 2016-cı ilin Aprel hadisələri zamanı şəhid olmuş Vətən oğullarının xatirəsinə həsr olunan tədbir keçirilib. Tədbirdə əvvəlcə öz qanları ilə tariximizdə qəhrəmanlıq dastanı yazan şəhidlərin ruhu bir dəqiqəlik sükutla yad edilib.



Sonra çıxış edən Pedaqoji fakültənin dekanı Qələmşah İdrisov, Tələbə Gənclər Təşkilatının (TGT) sədri Həcər Seyidəhmədova, sədr müavini Murad Şərifov Azərbaycan xalqının qəhrəmanlığının, birliyinin, mübarizliyinin bariz nümunəsi olan Aprel hadisələrindən danışıblar.

Daha sonra filialın Ədəbiyyat və dillər kafedrasının müəllimi Günəş Xudayarovanın Aprel hadisələrinə həsr olunan nümunəvi açıq dərsi keçirilib. Dərsdə Aprel hadisələri zamanı şəhid olmuş Vətən oğullarının xatirəsinə həsr olunan videoçarx nümayiş olunub, məlumatlar verilib. Tələbə-gənclər özləri də dərsdə xüsusi fəallıq nümayiş etdirib, Vətən üçün hər zaman canlarından keçməyə hazır olduqlarını bildiriblər.

# ADPU-nun Cəlilabad Filialında Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş görüş

Aprelin 18-də Bakı Dövlət Universitetinin (BDU) müəllimləri Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialının professor-müəllim və tələbə heyəti ilə görüş keçiriblər. Görüş Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunub. Tədbirdə BDU-nun dosenti Sevinc Əliyeva Azərbaycan Xalq Cümhuriyyətinin təhsil sahəsində gördüyü işlər, BDU-nun yaranması və 100 ildə qazandığı müvəffəqiyyətlər haqqında məlumat verib.



Filialın baş müəllimi Tofiq İsgəndərov çıxış edərək filialda Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyinə həsr olunan tədbirlər, müəllim və tələbələrin cənub bölgəsinin ictimai-siyasi həyatında rolu, elmi konfrans və jurnallarda çıxışları haqqında məlumat verib.

Sonda dosent S.Əliyeva tələbələri maraqlandıran sualları cavablandırıb. BDU-də fəaliyyət göstərən ixtisaslar və kafedralar, yeni texnologiyaların tətbiqi, yeni açılan ixtisaslar haqqında məlumat verib.

# ADPU-nun Şamaxı Filialında 2016-cı ilin Aprel hadisələri zamanı şəhid olmuş Vətən oğullarının xatirəsi yad edildi

Aprel hadisələrinin ikinci ildönümü ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında silsilə tədbirlər keçirildi. Belə ki, filialın kitabxanasında Aprel şəhidlərin xatirəsinə həsr olunmuş guşə yaradıldı. Aprelin 2-də bir qrup müəllim və tələbə tərəfindən 2016-cı ilin aprel hadisələri zamanı Şamaxı rayonundan şəhid olmuş Vətən oğullarının xatirəsi yad edildi.




İlk olaraq Şamaxı rayonunun Çuxuryurd kəndində dəfn olunmuş, ölümündən sonra "İgidliyə görə" medalı ilə təltif edilmiş Samir Ziyaddin oğlu Kaçayevin məzarı önündə ucaldılan abidə ziyarət olundu.

Daha sonra Göylər kəndində dəfn olunmuş, ölümündən sonra III dərəcəli "Hərbi xidmətdə fərqlənməyə görə" medalı ilə təltif olunmuş şəhid Elşən Səlim oğlu Səmədovun məzarı ziyarət olundu.

Son olaraq Şamaxı rayonunun Şəhidlər Xiyabanında dəfn olunmuş, ölümündən sonra III dərəcəli "Hərbi xidmətdə fərqlənməyə görə" medalı ilə təltif olunmuş şəhid Nazim Nadir oğlu Zəkarayevin məzarı ziyarət olundu.

Aprel şəhidlərinin məzarları önünə tər güllər düzüldü, ruhlarına dua oxundu. Filialın Təbiət və pedaqoji elmlər kafedrasının müəllimi Çingiz Dadaşov şagirdi olmuş şəhid Samir Kaçayev haqqında xatirələrini tələbələrlə bölüşdü. Tələbələr şəhidlərin məzarları önündə şeirlər səsləndirdilər və inandıqlarını bildirdilər ki, şəhidlərimizin qanı yerdə qalmayacaq. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi və güclü siyasəti sayəsində torpaqlarımızın geri qaytarılacağı gün uzaqda deyil. Ziyarət zamanı duyğulu anlar yaşandı.

Elə həmin gün filialın müəllim və tələbələri Şamaxı rayonunda yerləşən Mədəniyyət Sarayında təşkil olunmuş sərgidə iştirak etdilər. Rəssam Adil Şixaliyevin "Azərbaycanlıların soyqırımı" silsiləli əsərlərinin nümayiş olunduğu sərgidə həm azərbaycanlılara qarşı törədilmiş soyqırımı faktlarından, həm də rəssamın əsərlərinin mahiyyətindən bəhs olundu.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi fizika kafedrasının müdiri, dosent Cahangir Hüseynova, anası

**Nabat xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Yaş və pedaqoji psixologiya kafedrasının baş müəllimi Münəvvər Məmmədovaya, atası

**İsmayıl Əliyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi fizika kafedrasının dosenti Namiq Niftəliyevə, anası

**Leyla xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlīği verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1349
Sayı: 1500
Çapa imzalanıb: 30.04.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.